**“Bəraətu-ş-şeyxeyn min i`zəril cəhilin bitəuhidi rabbil aləmin”**

# Tövhidin təməlinə dair cəhalət

**Şeyxul-İslam**

**Əhməd bin Abdul-Həlim ibn Teymiyyə əl-Hərrani**

**və**

**Şeyxul-İslam**

**Muhamməd bin Abdul-Vahhəb ət-Təmimi ən-Nəcdi**

**(Bu iki böyük imamın tövhiddə cəhalətin üzr olmadığına dair sözləri)**


**Müəllif:**

**Bədr bin Əli bin Tami əl-Uteybi**

**Taif bölgəsində yerləşən dəvət və irşad mərkəzinin rəhbəri**


Ənsaru-s-sunnə

Rəhmli və Mərhəmətli Allahın adı ilə

Ən kamil həmd Allaha məxsusdur.Ona həmd edir, Ondan yardım diləyir, Ondan bağışlanma istəyirik. Nəfslərimizin şərindən və əməllərimizin pisliyindən Allaha sığınırıq.Allahın doğru yola müvəffəq etdiyi kimsəni heç kəs azdıra bilməz, azdırdığını isə heç kəs doğru yola gətirə bilməz.Şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan ilah yoxdur və şahidlik edirəm ki, Muhamməd Onun qulu və elçisidir.Allahın salavatı və salamı onun üzərinə olsun!

*“Ey iman gətirənlər! Allahdan layiqincə qorxun.Yalnız müsəlman olduğunuz halda ölün!”* (Ali İmran:102)

*“Ey insanlar! Sizi tək bir kəsdən yaradan, ondan zövcəsini yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! Bir-birinizdən istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizing üzərinizdə gözətçidir!”* (ən-Nisə:1)

*“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Əgər belə etsəniz, Allah) əməllərinizi islah edər və günah-larınızı bağışlayar.Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük səadətə nail olar.”* (əl-Əhzab:70-71)

Sözlərin ən xeyirlisi Allahın kəlamı yolların ən xeyirlisi isə Muhammədin yoludur.Ən şərli işlər isə yeniliklərdir.Hər bir yenilik isə bidət, hər bidət zəlalət, hər zəlalət isə atəşdədir.

Uca Allahın məxluqatı yaratmaqda olan başlıca məramı, Onun tövhidi, ibadətdə təkləşdirilməsi və dinin xalis ona aid edilməsi olmuşdur.

Uca Allah buyurur: *“Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın.”*[1]

Habelə buyurur: *“Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım.”*[2]

Habelə buyurur: *“Həqiqətən də, xalis din Allaha məxsusdur.”*[3]

Uca Allah bu yeri, göyü, canlı və cansızı, cinn və insanı yalnız həmin əzəmətli məramı gerçəkləşdirmək üçün yaratmışdır.Allahın tövhidi və Onun ibadətdə təkləşdirilməsi. Uca Allah buyurur: *“Yoxsa elə hesab edirdiniz ki, size əbəs yerə yaratmışıq və siz heç vaxt Bizə qaytarılmayacaqsınız?”*[4]

---

[1] ən-Nisə:36.

[2] əz-Zəriyat:56.

[3] əz-Zumər:3.

[4] əl-Muminun:115.

Habelə buyurur: *“Bəlkə insan özbaşına qoyulacağını güman edir?”.*[5]

Biz analarımızın bətnindən çıxmamışdan öncə Uca Alah bu tövhiddən ötrü bizdən əhdi-pehman almışdır.Hər bir müsəlman həmin hadisəni və bunun baş vermə keyfiyyətini xatırlamasa belə buna iman etmişdir.O zaman, Uca Allah Adəmin belinə əlini çəkmiş və oradan onun zürriyətini çıxararaq demişdir: Mən sizin Rəbbiniz deyiləmmi? Biz hamılıqla: Bəli, Rəbbimizsən!-dedik.Bunu etməklə, insanların qiyamət günü xəbərsiz olduqlarını, ata-babalara təqlid etdiklərini və üzərində olduqları dini onlara öncəki insanların miras buraxdığını dəlil gətirməmələrini üçün etmişdir.Uca Allah bu əhdi-pehman haqqında Qurani Kərimdə buyurur: “*Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən (gələcək) nəsillərini çıxardıb onları özlərinə şahid tutaraq: “Mən sizin Rəbbiniz deyiləmmi?” - soruşmuş, onlar da: “Bəli, Rəbbimizsən!” -deyə cavab vermişdilər. (Bunu etməyimizə səbəb isə) qiyamət günü: “Biz bundan qafil idik”; və ya: “Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, biz də onlardan sonra gələn bir nəsil idik.Məgər bizi batilə uyanların törətdikləri əməllərə görə məhv edəcəksən?”- deməməniz üçündür.”*[6]

---

[5] əl-Qiyamə:36.
[6] əl-Əraf:172-173.

Bu səbəbdən heç kəs inadkarlıq yaxud təqlid yaxud cəhalət yaxud təkzib etmə yaxud şübhə yaxud bu kimi hər hansı bir səbəbdən ötrü həmin əhdi pozmaqda və şirkə düşməkdə üzürlü deyil.

Son zamanlarda, sələfi və haqq əhlindən davamçısı olmayan bir tayfa meydana çıxmışdır.Onlar qəbirlərə sitayiş edənlərin, bütpərəstlərin, hətta yəhudi və nəsranilərdən olan müşriklərin cəhalət səbəbilə üzürlü olduqlarını və onlara hüccətin çatmadığını deyirlər.Onlar deyirlər: Bunların üzərindən hüccət qalxmamış, üstəlik onlar hüccəti anlamamış biz həmin adamları təkfir etmirik.

Onların bəzi əcaib sözləri isə ağıl sahiblərini tamamilə mat-məətəl qoyur.Belə ki, onlardan bəzisi deyir: "Əgər yəhudi və nəsrani,-müsəlmanların yekdilliyi ilə kafir olan-Qadiyəniyyə firqəsinin İslam dini olduğunu düşündüyü üçün ona daxil olarsa həmin adam cahilliyində üzürlü olan müsəlman olacaqlar!!" Bunu elm və bilik sahibləri kimi tanınan şəxslər deyir.

Bu və bu kimi sözlərin batil olması və heç bir əsasa dayanmaması bəlli məsələdir.Lakin bu məsələyə qarışıqlıq salan amil, həmin insanlar öz məqsədlərinə uyğun gəlsin deyə şəriətin nasslarından olan yığcam dəlilləri yozmaqla insanları saxtakarlığa sürükləyirlər.Artıq imam Əhməd kimi alimlər yaramaz yozum və qiyasdan çəkindirmiş və bu ikisinin şəriətin nasslarının dəlalət etdiyi mənadan və etiqad

edilməsi vacib olan şeylərdən uzaqlaşdıran əsas amil olduğunu demişlər.

Onlar alimlərin mütaşəbih sözlərini axtarır lakin açıq-aydın sözləri tərk edirlər.Uca Allah bizə mütaşəbihdən yapışıb açıq-aydın sözləri buraxmağı qadağan edib.Belə olan halda xəta edən və bilmədiyi səbəbilə haqqa müvəffəq olmayan zəif bir bəndə haqqında nə demək olar?!

Bundan daha şərli isə onların qədim və son zamanlarda olan zəlalət əhlinin adəti üzərə hərəkət edərək avam insanlara öz batillərini keçərli etmək üçün öz sözlərini dinin imamlarına nisbət etmələridir.Əslində bu, onlardan öncəki nəfsi istəklərinə uyan küfr və cahiliyyat əhlinin yoludur.Onlar öz zəlalətini Uca Allaha nisbət edib demişlər: *"Onlar yaramaz iş etdikləri zaman: Atalarımızı belə gördük. Bunu bizə Allah əmr etmişdir, - deyirlər.De: Allah yaramaz işlər əmr etməz. Allaha qarşı bilmədiyiniz şeyimi deyirsiniz?".*[7]

Yəhudi və nəsranilər İbrahimin (aleyhi-s-sələm) onların dini üzərə olduğunu iddia etmişlər.Uca Allah isə İbrahimi (aleyhi-s-sələm) onlardan uzaq tutub demişdir: *"İbrahim nə yəhudi, nə də xaçpərəst idi. O ancaq hənif müsəlman idi və* (Allaha) *şərik qoşanlardan da deyildi."*[8]

---

[7] əl-Əraf:28.
[8] Ali İmran:67.

Habelə sehrbazlar sehiri Süleymandan (aleyhi-s-sələm) miras olaraq aldıqlarını iddia etmişlər.Uca Allah isə Süleymanı (aleyhi-s-sələm) onlardan uzaq tutub demişdir: *"Süleyman kafir olmadı lakin şeytanlar kafir oldular."*[9]

Nəsranilər isə İsanın (aleyhi-s-sələm) insanları ona və onun anasına ibadət etməyə çağırdığını iddia etmişlər.Uca Allah buyurur: *"Xatırla ki, o zaman Allah belə buyuracaq: Ya Məryəm oğlu İsa! Sənmi insanlara: Allahla yanaşı, məni və anamı da özünüzə ilah bilin!- demişdin? (İsa cavabında) deyəcək: Sən paksan və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz."*[10]

Xatıb əl-Bəğdadi öz tarix kitabında Halləcin belə dediyini rəvayət edir: İnsan həccə yetişə bilməyəcəyi zaman evində bir yer ayırıb oranı nəcasətdən təmizləyəcək daha sonra həmin yerdə orada qeyd etdiyi tərzdə həcc edəcək.

Ona dedilər: Bunu haradan götürdün?

O, dedi: Həsən əl-Bəsrinin "ixlas" kitabından!

Əbu Ömər əl-Qadı ona dedi: Ey qanı halal olan, yalan dedin! Biz Həsən əl-Bəsrinin "əl-ixlas" kitabını Məkkədə dinlədik.Orada sənin dediklərindən heç bir şey yoxdur.

---

[9] əl-Bəqərə:102.
[10] əl-Maidə:116.

Məhz bu yondən iki böyük imama, Şeyxul-İslam Əbul Abbas Əhməd ibn Teymiyyə əl-Hərrani və Əbul Hüseyn Muhamməd bin Abdul-Vahhəb ən-Nəcdiyə tövhid məsələsində cəhalətin üzr olması sözü nisbət edilmişdir.Onlar bu iki imamın yığcam və qaranlıq sözlərini alıb ətraflı və açıq-aydın sözlərini tərk etmişlər.

Artıq bir çox yazılarında bu iki imamın müdafiəsinə qalxanlardan biri imam Əbu Abdur-Rahmən Abdullah bin Abdur-Rahmən Əbə Buteyn (rahiməhullah) olmuşdur.Mən həmin risalələri bir kitaba toplayıb ona bəzi izahlar gətirmiş və onu "irşədul abid ilə adəmil uzri bil cəhli fi əsli-t-təuhid" adını vermişəm.Uca Allah həmin kitabın işıq üzü görməsinə bizi müvəffəq etsin.Belə ki, şeyx Əbə Buteyn Şeyxul-İslam ibn Teymiyyə və onun şagirdi İbnul-Qayyimin cəhalət səbəbilə kafirlərin üzürlü olmayacaqlarına dair açıq-aydın sözlərini nəql etmişdir.Mən isə öz növbəmdə Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin bu məsələyə dair bəzi sözlərini müxtəsər şəkildə əlavə etdim.

Ondan öncə isə imam Abdur-Rahmən Ali-ş-Şeyx Osman bin Mənsura rəddiyəsində bu məsələni bəyan etmişdir. Həmin kitab dəfələrlə çap olunmuşdur.Artıq mən onun bir hissəsinə öz töhfəmi verib orada gələn bəzi ifadələr və sözlərə izahlar vermiş və ona "təhqiqu məzhəbi şeyxil-islam ibn teymiyyə fi məsələteyil uzri bil cəhl və təkfiril

muayyən" adını vermişəm. Uca Allah həmin kitabın işıq üzü görməsinə yardımçı olsun.

Onlardan daha öncə imam Muhamməd bin Abdul-Vahhəb "mufidul mustəfid fi kufri təriki-t-təuhid" kitabında Şeyxul-İslam ibn Teymiyyəni müdafiə edərək bu məsələni bəyan etmişdir.

Əziz qardaş! Bu kitabda Aləmlərin Rəbbi olan Allaha tövhiddə cəhalətin üzr olmadığına dair bu iki imamdan nəql olunan və yuxarıda adını çəkdiyim və adını çəkmədiyim kitablarda gələn ən açıq-aydın sözləri sənin üçün topladım. Habelə mən "tənibul anid və tənbihul bəlid ilə adəmil uzri bil cəhl fi əsli-t-təuhid" kitabında bu məsələ ilə əlaqəli olan mövzuya dair əlimdən gələni əsirgəməmişəm.Uca Allahdan onun tamamlanmasını diləyirəm.

# Fəsil

Bu iki imamdan bu mövzuya dair gələn açıq-aydın sözləri nəql etməyə başlamamışdan öncə bu kitaba nəzər yetirən hər bir şəxsə Uca Allahdan qorxmağı və alimlərin haqqa bələdçilik edən ulduzlar olduqlarını etiqad etməyi tövsiyə edirəm.Şübhəsiz ki, onların bütün dediklərinin haqq olduğunu iddia etmirik.Çünki dəlil yalnız Uca Allahın və Onun Peyğəmbərinin (salləllahu aleyhi və səlləm) sözlərindədir.

Uca Allah buyurur: *"Ey iman gətirənlər! Allaha itaət edin, habelə Peyğəmbərə itaət edin."*[11] Habelə buyurur: *"Aralarında hökm vermək üçün Allahın və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: "Eşitdik və itaət etdik!" - deməkdən ibarətdir.Nicat tapanlar da məhz onlardır! Allaha və Onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər -məhz beləlari uğura çatanlardır."*[12] Habelə buyurur: *"Rəbbinizdən sizə nazil edilmiş ən gözəl sözə tabe olun!"*[13] Habelə buyurur: *"Onlara: "Allahın nazil etdiyinə (Qurana) və Peyğəmbərə tərəf gəlin!"- deyildiyi zaman, münafiqlərin səndən büsbütün üz döndərdiklərini görərsən."*[14] Habelə buyurur: *"Bu,*

---

[11] ən-Nisə:59.
[12] ən-Nur:51-52.
[13] əz-Zumər:55.
[14] ən-Nisə:61.

*şübhəsiz ki, Mənim doğru yolumdur. Onu tutub gedin. Sizi Onun yolundan sapdıracaq yollara uymayın. (Allah) sizə bunları tövsiyə etdi ki, pis əməllərdən çəkinəsiniz!".*[15]

Alimlər demişlər: Allahın yolu Quran və sunnədir.

Habelə Uca Allah buyurur: *"Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!".*[16]

Elm əhli demişlər: Allaha həvalə etmək, yəni Onun kitabına qaytarmaqdır.Peyğəmbərə həvalə etmək isə, sağ ikən ona, ölümündən sonra isə onun sunnəsinə qaytarmaqdır.

Bu kimi məzmunlu ayə və hədislər çoxdur.Peyğəmbər (salləllahu aleyhi və səlləm) xütbəsinin əvvəlində deyərdi: "Allahın doğru yola saldığı şəxsi heç kəs azdıra bilməz.Azdırdığını isə heç kəs doğru yola sala bilməz.Ən doğru söz Allahın kitabı, ən xeyirli yol isə Muhammədin (salləllahu aleyhi və səlləm) yoludur.İşlərin ən şərlisi isə yeniliklərdir.Hər yenilik bidət, hər bidət isə zəlalətdir." Muslim səhih kitabında rəvayət etmişdir.

Habelə Buxari və Muslim Aişədən (r.a) rəvayət edirlər ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Hər kim bizim işimizə ondan olmayan bir yenilik gətirərsə o, rədd olunar."

---

[15] əl-Ənam:153.
[16] ən-Nisə:59.

Muslimin rəvayətində: “Hər kim bizim işimizdən olmayan əməl edərsə o, rədd edilər.”

Habelə Buxari Əbu Hureyradan (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “İmtina edəndən başqa bütün ümmətim cənnətə girəcəklər.Ona: İmtina edən kimdir?-deyildiyi zaman o, dedi: Mənə itaət edən cənnətə girər.Mənə asi olan isə imtina etmiş olar.”

İmam Malik (rahiməhullah) demişdir: “Bizdən elə birisi yoxdur ki, rədd edib rədd edilməsin.Ancaq bu qəbrin sahibi müstəsnadır.Bunu deyib Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbrini göstərdi.”

Habelə əz-Zuhri (rahiməhullah) və digərləri demişlər: “Sunnə, Nuhun gəmisidir.Ona minən qurtular, onu tərk edən isə həlaka düçar olar.”

Habelə əl-Əuzai (rahiməhullah) demişdir: “Əsərdən tutun! Sənin üçün müxtəlif sözlərlə gözəlləşdirsələr belə insanların görüşlərindən həzər et!”.

Bu səbəbdən elm əhli çəkişmə zamanı daimə Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) həvalə ediləcəyinə icma etmişlər.Uca Allah buyurur: *“Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və*

*Peyğəmbərə həvalə edin! Bu, daha xeyirli və nəticə etibarilə daha yaxşıdır."*[17]

Məsələləri səhabələr və tabiinlərdən olan sələfin və Əhli sunnədən olan elm əhlinin anlayışına uyğun şəkildə iki pak mənbəyə qaytarmaq gərəkdir.Kimliyindən asılı olmayaraq hər hansı bir şəxsin müxalif olması səbəbilə insanın Allahın və Peyğəmbərin sözlərini hüccət olaraq kiçiltməsi yol verilməzdir.

Bu səbəbdən ümmətin alimi Abdullah bin Abbasa (r.a) bəzi fiqhi məsələlərdə müxalif görüşlər çıxdığı zaman ona demişlər: Filankəs və filankəs bu cür deyirlər.İbn Abbas qəzəblənərək demişdir: Mən sizə Allahın Elçisi deyir söyləyirəm siz isə mənə filankəs və filankəs dedi deyirsiniz! Göydən üzərinizə daşların yağmaq ərəfəsidir."

Buxari və Muslim Əbu Bəkr əs-Siddiqin (r.a) belə dediyini rəvayət edirlər: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) etdiyi hər hansı bir şeyi tərk etməyəcəm və onu mütləq edəcəyəm.Çünki mən onun işindən olan bir şeyi tərk etdiyim zaman zəlalətə düşməkdən qorxuram."

İmam Şafii (rahiməhullah) demişdir: "Müsəlmanlar icma etmişlər ki, əgər birinə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsi bəlli olarsa həmin adamın onu hər hansı bir şəxsin sözünə görə buraxması haramdır."

---

[17] ən-Nisə:59.

Mən bu kitabda bu iki imamın sözlərini nəql etdiyim zaman bununla onların sözlərini Allahın və Peyğəmbərin (salləllahu aleyhi və sələm) sözlərinin önünə çəkmirəm.Çünki-Allaha həmd olsun- Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu məsələyə dair sözləri günün günorta çağındaki günəşdən daha aydındır.Buna misal Uca Allahın "əl-Ənam" surəsindəki sözləridir: *"Əgər Biz mələkləri onlara göndərsəydik, ölülər onlarla danışsaydı və hər şeyi dəstə-dəstə toplayıb onların qarşısına qoysaydıq belə, Allah istəmədikcə, onlar iman gətirəcək deyildilər. Lakin onların əksəriyyəti (bunu) bilməz."*[18]

Məgər onların cahilliyi onlar üçün üzr oldu?!

Allahın hidayət vermək istəmədiyi şəxsi heç bir təbliğatçının təbliği yaxud hər hansı alimin izahı İslama daxil etməz.Uca Allahın kitabı hüccət və bəyan olaraq kifayət edər! Bununla birgə Uca Allah bəzi qəlbləri onu anlamağa yönəldir digər qəlbləri isə ondan uzaqlaşdırır.Uca Allah buyurur: *"Əgər Allah onlarda bir xeyir (olacağını) bilsəydi, (haqq sözü) onlara eşitdirərdi. Əgər onlara eşitdirsəydi belə, yenə də üz çevirib dönərdilər."*[19]

Üstəlik Uca Allah bəzən hidayət vermək istəmədiyi şəxsin azğınlığını daha da artırır və Quran ilə onun nifrətini və dindən üz döndərməsini daha da dərinləşdirir. Uca Allah buyurur: *"İnsanlar düşünüb ibrət alsınlar deyə, Biz bu Quranda (Allahın vəhdaniyyət əqidəsini cürbəcür dəlillərlə, müxtəlif misallarla) izah etdik. Lakin (bu izahat) onların*

---

[18] əl-Ənam:111.
[19] əl-Ənfəl:23.

*yalnız nifrətini artırdı."*[20] Habelə Uca Allah buyurur: *"Biz onları qorxuduruq, lakin bu qorxutmaq onların tüğyanını artırmaqdan başqa bir şeyə kara gəlmir!"*[21] Habelə buyurur: *"Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalımların ancaq ziyanını artırır."*[22] Habelə buyurur: *"De: O, iman gətirənlərə hidayətdir və şəfadır.İman gətirməyənlərin isə qulaqlarında karlıq vardır.O, (Quran) onları kor etmişdir. Onlar (sanki) uzaq bir yerdən çağırılırlar."*[23]

Quran oxuyan və onu əzbərləyən daha sonra Allaha şərik qoşan insanların halına necə dözmək olar? Ardından onların cahillik səbəbilə üzrlü olması bəhanəsi ilə onlara hökm verməkdən boyun qaçırılır.

Uca Allahın "əl-Kəhf" surəsində gələn kəlamı haqqında düşün: *"De: Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir. Halbuki onlar yaxşı işlər gördüklərini zənn edirlər."*[24] Onlar cahildirlər.Onlar düşünürlər ki, yaxşı işlər görürlər.Lakin onların bu düşüncəsi Allah qatında onların dadına çatmamışdır.

Habelə Uca Allah "Fətir" surəsində buyurur: *"Pis əməli özünə yaxşı göstərilib onu yaxşı görən (Allahın doğru yola yönəltdiyi kimsəyə bənzərmi?!) Şübhəsiz ki, Allah istədiyini*

---

[20] əl-İsra:41.
[21] əl-İsra:60.
[22] əl-İsra:82.
[23] Fussilət:44.
[24] əl-Kəhf:103-104.

*zəlalətə, istədiyini də doğru yola salar.Artıq onlara görə özünü üzüb həlak etmə. Həqiqətən, Allah onların nə etdiklərini biləndir!"*[25]

Əgər bir kimsənin qəlbi cahil müşriklərdən ötrü yumşalıb: Onlar cahil olduqları və özlərinin doğru yolda olduqlarını düşündükləri halda onları necə təkfir edə bilərik?!- deyərsə, həmin adama İzzət və Cəlal sahibi Allahın qəhr edib susduran cavabı ilə cavab ver: "*Şübhəsiz ki, Allah istədiyini zəlalətə, istədiyini də doğru yola salar.Artıq onlara görə özünü üzüb həlak etmə. Həqiqətən, Allah onların nə etdiklərini biləndir!*"

Buna dair ayələr həddindən savayı çoxdur.Mən həmin ayələri "tənibul anid" kitabında toplamışam.Uca Allah onu tamamlamağı müyəssər etsin!

Uca Allah Quranda cahilliyi qeyd etdikdə daimə onu pisləyir və həmin vəsfi müşriklərin vəsfləri sırasında qeyd edir.

Təəccüb doğuran amil, onları cahillik səbəbilə üzrlü görən şəxslər həmin adamların Quranı oxuyub onu anlamadığını iqrar edirlər.Daha sonra ona, bəyan olunub izah edilənə qədər küfr hökmünü verməkdən boyun qaçırır.

Məgər Uca Allahın məxluqatı yaratmaqda, kitabları nazil etməkdə və peyğəmbərləri göndərməkdə qayəsini bəyan

---

[25] Fətir:8.

etmək üçün Allahın kəlamından daha açıq və daha aydın izah edən bir şeymi var?

Subhanəllahi-l-azım!

Uca Allahın kəlamı açıq-aydın və mətanətlidir.Onun kəlamı hidayət və nur, habelə bəyan və şəfadır.Məgər əzəmətli tövhidi bəyan etmək üçün onun hüccət olması yetərli deyil ki, biz aləmlər üçün hüccət olsun deyə ifadələrinə nöqsan daxil olan və izah və açıqlamada qüsurdan yan qalmayan şəxslərin sözlərinə ehtiyac duyaq?!

Bu hansı mövzudur? ”Lə iləhə illəllah” kəlməsinin gerçəyi olan aləmlərin Rəbbini təkləşdirmək və müşriklərin dinindən uzaq durmaq kimi Peyğəmbərə (salləlla-hu aleyhi və səlləm) gələn əsas məramdır!

Budur onlar zinanın, sələmin, şərab içməyin və adam öldürməyin haram olduğunu bilmişlər.Məgər bu əhkamlar və bəlalar Uca Allahın tövhidinin vacib olması və şirkin haram olması hökmündən daha aydındır ki, biz bunlardan həmin məsələləri insanlara izah edən və açıqlayan şəxsi gözləyək?!

Artıq mən elm və araşdırma yönlü olan bir məclisdə müxaliflərdən birinə dedim: Qurani Kərimdə tövhid məsələsinə dair cahilliyin üzrlü olmasına heç bir dəlil yoxdur. Sonra isə bir neçə il möhlət verdim.Həmin şəxs Qurani Kərimdən dəlil olaraq yalnız növbəti ayələri tapa

bilmişdir: *“Ey Rəbbimiz, unutduqda və ya yanıldıqda bizi cəzalandırma!”*[26] Habelə: *“Biz peyğəmbər göndərməmiş əzab verməriк.”*[27]

Qısa olaraq bu iki ayənin dəlil gətirilməsi haqqında cavab verib deyirəm:

Birinci ayə: Uca Allah bütün mükəlləf şəxsləri düşdükləri yanlışlıqdan ötrü üzrlü etmişdir.Yanlışlıq, qəsdin yoxluğudur. Cəhalət isə qəsd olsa belə elmin yoxluğudur.

Qəsdin yoxluğu mükəlləfin əlində deyil.Elmin yoxluğu isə fərqlidir.Mən aydın olsun deyə müxalifə misal çəkib dedim: Əgər biri ayağını Quran yazısının üzərinə qoyub onun Quran yazısı olduğunu bilməzsə onun haqqında nə deyiləcək? Onun yanlış etdiyi yoxsa cahil olduğu deyiləcək?

Əgər sən: Yanlışlıq etmişdir,-desən, onun qəsdis olduğu səbəbilə doğru demiş olarsan.

Ancaq əgər sən: Cahildir,-desən, deyiləcək: Burada cahilliyin buna heç bir aidiyyatı yoxdur.Çünki cahillik iradəyə daxil deyil.Qəsdin mənbəyi isə iradədir.

Daha sonra ona dedim: Habelə başqa bir misal vardır:

---

[26] əl-Bəqərə:286.
[27] əl-İsra:15.

Belə ki, əgər bir şəxs ayağını Quran yazısının üstünə qoyub: Bunun Quran yazısı olduğunu bilirəm, yəni bunu qəsd edir.Lakin mən Quran yazısını ayağlayanın kafir olacağını bilmirdim,-deyərsə, bu şəxs haqqında onun yanlışlıq edən deyil cahil olduğu deyiləcək.Çünki burada qəsd yer almışdır.Həmin şəxs bilmədiyini deyərsə belə bu, böyük küfrdür.

İkinci ayə barəsində isə doğru görüş təfsirçilərin qeyd etdiyi kimi dünyavi əzabdır.Çünki Uca Allahın insanlara çəkinməli və etməli olduqları şeyləri bəyan edən peyğəmbər göndərməmiş ümmətlərdən hər hansı birini yerə batırmaq, eybəcər hala salmaq və digər şeylər kimi ümumi bir əzaba düçar etməmək Onun mərhəmətindəndir.Bu səbəbdən, ondan sonraki ayənin Allahın əmrinə müxalif çıxmış məmləkətlərə dünyavi əzabın və rəbbani cəzanın gəlişi haqqında bəhs etdiyini görmək mümkündür. *“Biz bir məmləkəti məhv etmək istədikdə (peyğəmbərlərin dili ilə) onun naz-nemət içində yaşayan başçılarına (Allaha itaət etməyi, iman gətirməyi) əmr edərik. Lakin onlar (Allaha asi olub) pis-pis işlər törədərlər. Beləliklə, (həmin məmləkətə) hökm vacib olar və onu yerlə yeksan edərik.Biz Nuhdan sonra neçə-neçə ümmətləri məhv etdik.Rəbbinin öz qullarının günahlarını bilməsi, görməsi kifayət edər.”*[28]

---

[28] əl-İsra:16-17.

Habelə bu ayə ilə axirət əzabı qəsd edilə bilər.Lakin həmin əzab şirkdən savayı olan günahlarla muqayyəd olacaq.Çünki buna dair ümumi gələn nasslara əsasən Uca Allah mütləq şəkildə şirki bağışlamır.

Habelə Uca Allah ümmətlərə elçi göndərməmiş onların üzərindən əzabı qaldırmışdır.Öncəki ümmətlərə gələn peyğəmbərlər cinlərdən və insanlardan olan başqa ümmətlərə deyil xüsusi olaraq onlara göndərilirdi.Lakin bu, Muhamməddin (salləllahu aleyhi və səlləm) ümmətinə aid deyil. Çünki Uca Allah onu bütün məxluqata göndərmişdir.Bu səbəbdən, Peyğəmbərin gəlişindən sonra mövcud olan hər bir şəxsin üzərindən hüccətin qalxmış olması doğru səslənir. Çünki peyğəmbərin ayrıca hər bir şəxs üçün göndərilməsini peyğəmbərliyin tələblərindən deyil.Bu heç Peyğəmbərin (salləllahu aleyhi və səlləm) həyatında olmamışdır.Elə isə onun ölümündən sonra bunu demək nə dərəcədə doğrudur?

Bir sözlə, müşrikləri cahillik səbəbilə üzürlü sayan şəxsin etimad edəcəyi heç bir dəlili yoxdur.

Onlar Quran və sunnədə onların dadına çatacaq dəlil tapa bilmədikləri zaman alimlərin mütaşəbih sözlərinə əl atıb ondan yapışmışlar.

Belə olan halda bəyan və izahı tamamlamaq üçün onlarla birlikdə bu yolu getmək qaçılmaz olmuşdur.Onlar bu sözləri Şeyxul-İslam ibn Teymiyyə və Şeyxul-İslam Muhamməd bin

Abdul-Vahhəbə nisbət etdikləri zaman mən haqqı axtaran hər bir şəxsin nəzərinə onların bu mövzuya dair açıq-aydın sözlərini çatdırmaq və bu iki imamdan tövhiddə cahil olanın üzürlü olmayacağına dair açıq-aydın sözləri ona nəql etmək istədim.

Nəql etdiyim sözləri onların nəql etdiyi sözlərin müqabilində qoyduğum zaman həmin sözlər növbəti hallardan kənar çıxmır:

(1)-Onun ziddiyətli olmasıdır.Belə olan halda biz onun hamısını tərk edirik.

(2)-Yaxud onun bir-birinə uyğun gəlməsidir.Belə olan halda biz onun hamısını götürürük.

(3)-Yaxud biz nəfsi istəyə uyğun gəlsin deyə onun bəzisini götürür digərini isə tərk edirik.

Birinci bu iki imamın yüksək məqamı səbəbilə rədd olunur.

İkinci isə, doğru olan da məhz budur, bu məsələyə dair onların digər sözlərini cəm etməkdir.Belə olan halda onların cahilliyin üzr olması haqqında gələn bütün sözləri, uzaq çöllükdə yaşayan yaxud küfrdən yenicə çıxmış insanlar kimi bilgisiz olması mümkün olan insanlar üçün şəriətin buyurduğu gizli məsələlərə aid edilir.Lakin onlardan gələn

digər açıq-aydın sözlərə əsasən tövhidin əsasında üzr yoxdur.

Lakin bu məsələdə müxalif olanlar-Allah onlara hidayət versin-üçüncü məsləkə meyl edib onların nəfsi istəklərinə uyğun gələni götürmüş, habelə rəddiyə və açıqlama əsnasında olsa belə bu iki imamın tövhidin əsasında cahilliyin üzr olmaması məsələsinə dair açıq-aydın sözlərini diqqətsiz qoymuşlar.

Onlardan bəzisi daha da irəli gedərək bu imamların yanlışlıq etdiyini bildirmiş və açıq-aydın sözləri zahirindən döndərmək üçün dəridən qabıqdan çıxmışdır.

Habelə bunlar özləri onlara müxalif olan insanlarla rəftar və münasibətdə öz məsləklərinə zidd gəlmiş və öz qaydalarını tərk etmişlər.Həmin şəxslər onlara müxalif olanları şər`i nassları anlamaqda cahilliklə vəsf edir, onları buna görə pisləyir, hətta bəzi hallarda varid olan hədisi dəlil gətirib onları təkfir edirlər: "Kim qardaşına ey kafir deyərsə, həmin söz onlardan birinə qayıdar."

Həmin adamlar onlara müxalif olanları etdikləri ictihada görə yaxud cahil olduqları fərz edilərsə cahilliyə görə üzürlü etmirlər.Onlar isə tövhid əhlidir! Bu arada onlar bütlərə, ulduzlara, göy cismlərinə ibadət edən və Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) zidd gələn bütpərəstlərə üzrlər gətirirlər.Qoy bu insanlar Uca Allahın bu ayəsi haqqında düşünsünlər: *"Budur, siz dünyada onlardan ötrü*

*mübahisə etdiniz, bəs qiyamət günü kim onlardan ötrü Allahla mübahisə edəcəkdir? Yaxud onlara kim vəkil olacaqdır?”.*[29]

Haqqı axtaran qardaşım! Budur sənin önündə bu iki böyük imamın sözlərindən qısa olaraq topladığım açıq-aydın sözlərdir.Bu mövzuya dair bu iki imamdan daha çox və ətraflı sözləri isə digər bir yerdə toplamışam.Müvəffəq edən Allahdır.

[29] ən-Nisə:109.

# Fəsil

## Allahın tövhidinə dair cahil olan müşriklərin üzürsüz olduqları haqqında Şeyxul-İslam ibn Teymiyyədən nəql edilən sözlər

1-Şeyxul-İslam (rahiməhullah) "əl-fətəva:4/53-54" demişdir: "Habelə kəlam əhlindən olan elə bir şəxs bilinmir ki, onun İslam dininə dair ümumən müsəlmanların və hətta onun əshabının ona görə təkfir edəcəkləri sözü olmasın Ümumilik isə müəyyənliyi ehtiyacsız edir.Elə isə bunlardan hansı həşvə və zəlalətə daha haqlı firqədir? Bu isə onlarda, bir çox hallarda nifaq olduğu kimi mürtədliyin olmasını tələb edir.Bu gizli sözlərdə olacağı zaman deyilə bilər ki, həmin insan yanlışlıq etmiş, zəlalətə düşmüş və onun üzərindən sahibini kafirə çevirən hüccət qalxmamışdır.Lakin bu, sıravi və xüsusi dairə müsəlman-larının bildiyi zahiri işlərsə onlardan hasil olur və müsəlmanlar bunun müsəlmanların dinindən olmadığını, üstəlik yəhudi və nəsranilər Muhammədin (salləllahu aleyhi və səlləm) bununla göndərildiyini və buna müxalif olanları təkfir etdiyini bilirlər.Buna misal, Bir və şəriksiz olan Allaha ibadət etmək əmri və mələklər, peyğəmbərlər, günəş, ay, ulduzlar, bütlər

və digər şeylər kimi Allahdan qeyrisinə ibadət etməyi qadağan etməkdir.Bu işlər, İslamın ən aşkar şüarlarıdır.”

Dedim: Bu, Şeyxul-İslamın açıq-aydın sözlərindəndir. Şeyxul-İslamın, bəzən sahibini üzürlü edəcək cəhaləti necə əhkam və şaxəli məsələlərdən olan gizli işlərdə olan cahil-likdən etdiyinə diqqət yetir.Lakin Allahın tövhidini əmr etmək və şirki yasaq etmək kimi İslamın zahiri şüarlarında heç kəs cəhaləti səbəbilə üzürlü deyil.

Cahildən üzürün qəbul olunması və əhkam və buyu-ruqlar məsələlərindən olan gizli məsələlər ilə Uca Allahın tövhidinin vacibliyi, Allahın ibadətdə təkləşdirilməsi kimi habelə namaz və digər zahiri şüarlar kimi zahiri məsələlər arasında fərqin qoyulmasına dair təfsilatın mövcudluğu qədim zamandan bəri alimlərin tutunduqları məsləkdir.

Habelə Şeyxul-İslam ibn Teymiyyə və Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhuməllah) bu məslək üzərə olmuşlar.Habelə qədim alimlərdən bunu vurğulayan şəxslərdən:

1-Əbu Hənifədir (rahiməhullah).Belə ki, əl-Kəsəni “bədəiu-s-sanəi`:7/132” kitabında nəql edib deyir: “Əbu Yusuf Əbu Hənifədən bu ifadəni nəql edib demişdir: Əbu Hənifə deyərdi: Yaradılanlardan heç kəs Yaradını haqqında bilgiyə dair cahilliyində üzürlü deyil.Çünki bütün yaradılanların, göylərin və yerin yaradılışını və özünün yaradılışını, habelə

Allahın yaratdığı digər şeyləri gördüyü üçün Rəbbini tanıması və Onu təkləşdirməsi vacibdir.Fərz əməllərə gəldikdə isə, əgər biri onu bilməz və ona hüccət çatmazsa həmin şəxsin üzərindən hökmü hüccət qalxmış olmaz." İbn Teymiyyənin "dər`u təarudil aqli va-n-nəql:9/62" kitabına bax.

2-Budur imam Muhamməd bin İdris əş-Şafii (rahiməhullah) ən məşhur kitablarından biri olan "ər-risələ: 357-səh" kitabında deyir: Biri mənə demişdir: "Elm nədir? Elmdən insanlara vacib olan nədir? Mən ona dedim: Elm iki qismdir: Adi insanların elmi.Bu, ağlında qüsür olmayan hər bir həddi-buluğa çatanın cahil olması yolverilməz olan elmdir. Həmin adam: Misal üçün nə kimi şeylər? Dedim: Beş namaz, habelə Allahın insanlara Ramazan ayında oruc tutmağı, güc yetirənə həcc etməyi və mallarından zəkat çıxartmağı vacib etməsi, habelə onlara zina, qətl, oğurluq və şərab içməyi haram etməsi, habelə insanların anlamaq və özləri və mallarından verəmək, həmçinin onlara haram olan şeylərdən əl çəkmək ilə mükəlləf olduqları bu mənada gələn digər şeylər.[30]Elmdən olan bu qism bütövlüklə Allahın kitabında nass olaraq varid olmuşdur. Habelə o, İslam əhlində ümumi surətdə mövcud olmuş və onların çoxu bunu özlərindən

[30] Bu, şəhadətdən sonra ən müəkkəd və vacib fərzlərə dairdir.Elə isə, Uca Allahın tövhidi və Onun ibadətdə təkləşdirilməsi və Allaha şərik qoşmağın haramlığı necə olsun?! Bu, mükəlləfin cahil olması yolverilməz olan daha öndə olan məramdır.

öncəki insanlardan nəql edir və bunu Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) hekayət edirlər.Onlar öz aralarında bunun hekayət olunması və bunun onların üzərinə vacib olması məsələsində çəkişmirlər.Bu, xəbər və yozumda yanlışlığın olması mümkünsüz olan və çəkişmə mövzusu olması icazəli olmayan ümumi elmdir.

O, dedi: İkinci cəhət nədir?

Dedim (deyən imam Şafiidir): Quranda açıq gəlməyən və çoxuna dair həmçinin sunnədən nass olmayan və insanlara əzr edilən fərzlərin şaxəli məsələləri və ona aid olan əhkamlar və digər şeylərdir.Onun az bir hissəsinə dair sunnə olarsa belə bu, ümumi insanların deyil xüsusi dairə insanların xəbərlərindən və yozum ehtimalları daşıyan və qiyas ilə tənzimlənən işlərdən olacaq."

3-İmam Muhamməd bin Cərir ət-Tabəri (rahiməhullah) bu məsələyə dair təlif edilən ən yaxşı kitablardan biri olan "ət-təbsir fi məalimi-d-din:116" kitabında burada qısa olaraq nəql edəcəyim sözlər ətarfında geniş danışaraq demişdir: "Daha sonra Uca Allahın Öz qullarını sınağa çəkdiyi bütün din işləri iki mənanı adlamır:

Birinci: Allahın tövhidi və ədaləti.

İkinci: Onun öz qullarına halal və haram, habelə qərarlar və əhkamlar olaraq qoyduğu buyuruqlardır.

Allahın tövhidi və ədaləti: Ona dair gerçək elmin idrakı, hissiyat orqanlarının idrak etdiyinə əsasən çıxan nəticə ilə hasil olur.[31]

Allahın buyuruqlarına gəldikdə isə, Ona dair gerçək elmin bir qismi eşitmə hissiyatı[32] ilə digər qisminə dair elm isə eşitmə hissiyatının idrak etdiyinə əsasən çıxan nəticə ilə dərk edilir.

Ardından gerçək elmin eşitmə hissiyatına əsasən çıxan nəticə ilə idrak edildiyi barəsində söhbət iki yönlüdür:

Birinci: İnsan bu işdə xəta edəcəyi zaman üzürlü olur. Burada xəta edən şəxs ictihad, araşdırma və səy göstərdiyinə görə əcr qazanır.Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Əgər biri ictihad edib doğru nəticəyə gələrsə iki əcr qazanar.Lakin əgər biri ictihad edib yanlış nəticəyə gələrsə bir əcr qazanar."

Bu xəta, səhih görüşə dair dəlillər birmənalı deyil müxtəlif olacağı, habelə buna dəlil olaraq gətirilən əsaslar yekdil deyil fərqli olacağı zaman keçərli olacaq.

Bir qədər sonra demişdir: Digərinə gəldikdə isə, əmr və qadağa həddinə çatmış mükəlləfin o işdə xəta etməsi onun üçün üzr deyil.Habelə buna dair cahil olan şəxs cəhaləti

---

[31] Hissiyat orqanlarının idrak etdiyinə əsasən çıxan nəticə ilə bilinən elm, məsələn, buraxdığı izləri ilə dərk edilən ümumi qeybi məsələlərdir.

[32] Hissiyatın idrak etdiyi elm isə,məsələn, müşahidə olunan işlərdir.Günəşin istisi, qarın soyuq olması, peyğəmbərlərin möcüzələri v.s.

səbəbilə təkfir olunur.Bu isə bir şeyin səhih olmasına dair dəlillərin müxtəlif deyil yekdil, habelə fərqli deyil birmənalı olanını şamil edir.Bununla bərabər o, hissiyat orqanları vasitəsilə rahat dərk edilir.

Bir qədər sonra demişdir: Ancaq müxtəlif deyil yekdil, habelə gizli deyil hissiyatda aşkar olan dəlillər səbəbilə qəlbən mükəlləfiyyət əhlindən olana, Allahın dinindən bil-gisiz olması icazəli olmayan məsələ Uca Allahın tövhidi, Onun ad və sifətləri habelə ədalətinə dair bilgidir.Çünki sağlam və əngəllərdən kənar olub mükəlləfiyyət həddinə çatan hər bir şəxs, Uca Rəbbin təkliyinə dəlalət edən və bunun həqiqət olduğunu bəyan edən açıq-aydın sübut və dəlildən məhrum olmur. Məhz bu səbəbdən, Uca Allah cəhalət vəsfi ilə səciyyələnən heç bir şəxsi üzürlü etməmiş və onu, həmin cəhalət üzərə öləcəyi təqdirdə inadkarlar sinfinə daxil etmişdir.Uca Allah və Onun rübubiyyəti haqqında bilgidən sonra yer alan ixtilaf dünya əhkamlarına və axirət əzabına dairdir.Uca Allah buyurur: *“De: “Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi?” O kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir. Halbuki onlar yaxşı işlər gördüklərini zənn edirlər.Onlar o kəslərdir ki, Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar etdilər, bununla da onların bütün əməlləri puça çıxdı. Buna görə də Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq!”.*[33]

Daha sonra dedi: Uca Allah, Onu razı salmayan əməllər edən və əməllərində Allahı razı saldığını düşünən şəxsi,

---

[33] əl-Kəhf:103-105.

dünyada Özünün inadkar düşmənlərinin və Allahın Rəbb olduğunu bilib Onu dananların adları ilə çağırmaqla onları eyni müstəviyə qoymuş və axirət cəzası və əzabında onu onlarla bir etmişdir.Çünki biz artıq Allahın təkliyinə, ad və sifətlərinə və ədalətinə dair yanlış ictihad edənin halının buna dair inadkarlıq edən insanın halı ilə eyni olduğunu vurğulamışıq.Çünki onlar üçün həmin dəlillərin müxtəlif deyil yekdil olduğu hissiyat orqanlarında aşkardır.Uca Allah həmin iki sinif insanın hissiyat orqanlarında dəlilləri və hüccətləri aşkar etdiyi səbəbilə onlar üzrsüz olmaqda eyni olmuş və bu zaman əzab və cəzada onların bərabər olması vacib olmuşdur.

Bu hökm, buyuruqlara dair cəhalət hökmündən fərqlidir.Çünki artıq qeyd etmişəm ki, əgər Uca Allah dinin buyuruqlarından vacib etdiyi bir fərz hər hansı bir şəxsin üzərindən qaldırdığı hüccət ilə üzürü kəsməzsə insanın həmin fərzin vacibliyinə dair elmə yiyələnməsi mümkün olmayacaq.Çünki fərzin vacibliyinə heç bir dəlil yoxdur. Məsələ belə olacağı zaman insan bunu etməyə əmr olunmuş hesab edilməyəcək.İnsan əmr olmayacağı zaman isə Allah üçün edilən əməli tərk etdiyinə görə günahkar olmayacaq”.

Dedim: Bu böyük imamın gətirdiyi bölgüyə diqqət yetir! Belə ki, imam mükəlləfə vacib olanı iki qismə bölmüşdür:

Birinci: Hissiyat və eşitmə vasitəsilə bilinən qism.Bu isə, Uca Allahın tövhididir.Bu məsələdə heç bir şəxs cəhaləti səbəbilə üzürlü deyil.Burada inadkarla cahil arasında heç bir fərq yoxdur.

İkinci: Yalnız eşitmə yolu ilə bilinən qism.Bu isə, şəriətin buyurduğu digər fərzlərdir.

İmam bunu iki növ etmişdir:

Birinci növ: İxtilaflı və mübahisəli mövzular.Burada xəta edən və cahil şəxs üzürlüdür.

İkinci növ: Namazın vacibliyi və zinanın haramlığı kimi dəlillərin yekdil olduğu və dində zəruri olaraq bilinən işlər. Bu işlərdə insan üzrlü deyil.

Bu, İbn Cəririn (rahiməhullah) xülasə olaraq qeyd etdiyim sözləridir.İmamın digər önəmli sözlərinə qeyd edilən kitabda baxmaq mümkündür.[34]

4-Bu bölgüyə bənzər bölgünü Xatıb əl-Bəğdədi "əl-fəqih val mutəfəqqih:2/128" kitabında gətirmişdir: "Təqlidə dair söhbət və ona dair icazəli olan və icazəli olmayan haqqında bölüm: Artıq əhkamların bilinməsi üçün müctəhidin müraciət edəcəyi dəlilləri qeyd etmişəm.Qaldı əmələ dair avam insanın müraciət edəcəyi işləri bəyan etmək.Həmin iş, təqliddir.Bir sözlə təqlid: Sözü dəlilsiz qəbul etməkdir.Əhkamlar isə iki növdür: Əqli və şər`i əhkamlar.

---

[34] Bilmək lazımdır ki, böyük ehtimalla ibn Cərir bu məsələyə dair müstəqil əsər yazan ilk şəxs olmuşdur.Bu, "ət-təbsir fi məalimi-d-din" kitabıdır.Sanki ibn Cərir yaşadığı dönəmdə bu məsələyə dair əleyhdarların həmlələrini dəf etmişdir. Bu səbəbdən, əgər biri onun təfsir kitabını oxuyarsa bir çox yerdə tövhiddə cahilin küfrünə diqqəti yönəltdiyini görə bilər.

Şeyximiz Abdur-Rahmən əl-Ayyəf əl-Hənbəli əl-Əsəri ona hədiyə olunan nüsxədə mənim bu sözlərimə əlavə verərək demişdir:Bu, daimə diqqət mərkəzində olması umulan dəyərli bölgüdür.Çünki orada haqqı istəyən şəxs üçün lazımı və yetərli məlumat vardır.

Əqli əhkamlar: Uca Yaradanı, Onun sifətlərini bilmək, habelə peyğəmbəri və onun sadiq olduğunu bilmək və digər əqli əhkamlarda təqlid etmək olmaz.Ubeydullah bin Həsən əl-Anbərinin belə dediyi xəbər verilir: Dinin əsaslarında təqlid etmək olar?! Əslində isə bu, yanlış sözdür.Uca Allah buyurur: *“Rəbbinizdən sizə nazil edilənə tabe olun. Allahı qoyub başqa dostlara uymayın.Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!”*.[35]

Daha sonra bu məsələyə dair bir sıra ayələr və dəlillər gətirdikdən sonra növbəti rəvayəti qeyd etmişdir: Abdullah bin Məsud (r.a) demişdir: “Bir kişi digər kişinin dininə təqlid etməsin.O, iman edəcəyi zaman iman edəcək, küfr edəcəyi zaman küfr edəcək!”.

Dedim (deyən Xatıb əl-Bağdədidir): Çünki qeyd etdiyimiz əsasların yolu ağıldır.İnsanların hamısı ağılda müştərəkdirlər.Bu üzdən həmin məsələdə təqlid etmək mənasızdır.

Şər`i əhkamlar isə iki növdür:

Birinci növ: Beş namaz, zəkat, Ramazan orucu, həcc, zinanın və şərab içməyin haram olması və bu kimi Peyğəmbərin dinindən zəruri olaraq bilinən işlər.

Bu işlərdə təqlid etmək olmaz.Çünki bütün insanlar bu işləri idrak etməkdə və bilməkdə müştərəkdirlər.Bu üzdən həmin məsələdə təqlid etmək mənasızdır.

---

[35] əl-Əraf:3.

İkinci növ: Yalnız araşdırma və dəlillərə baş vurma vasitəsilə bilinən işlər.Buna misal, ibadətlər, münasibətlər, nikahın şaxəli məsələləri və digər əhkamlardır.Bu işlərdə təqlid etmək icazəlidir.Buna dəlil olaraq Uca Allah buyurur: *"Əgər bilmirsinizsə, zikr əhlindən soruşun!".*[36]" Habelə Xatıb əl-Bəğdədi və İbn Cəririn yuxarıda qeyd etdiyi bölgüyə müvafiq gələn digər sözləri.

5-Habelə imam Xatıb əl-Bəğdədi "əl-fəqih val mutəfəqqih:1/180-196" kitabında Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözlərinə izah verərək demişdir: "Elm tələb etmək hər bir müsəlmana fərzdir.": Elm əhlindən bəzisi demişdir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu sözlə yalnız tövhid elmini və ağıl sahibini mömin edən işləri qəsd etmişdir. Çünki hər bir müsəlmana bunu bilmək vacibdir.Hər hansı bir şəxsin bundan cahil qalması yolverilməzdir.Çünki bunun vacibliyi xüsusi dairə insanlar üçün deyil ümumi şəkildə gəlmişdir."

6-Habelə Xatıb "iqtidaul ilmil aməl:15-səh" kitabında Səhl bin Muzəhimin sözlərini rəvayət etmiş və ardından izah verib demişdir: "Alim üçün məsələ doxsan sayının barmaqlarda sıxılan halından daha sıxdır.Cahilin cəhalətində üzürlü olmadığına rəğmən alim əzab baxımından daha acınacaqlı haldadır."

---

[36] ən-Nəhl:43.

7-İmam Muhamməd bin Nəsr əl-Mərvəzi "təzımu qadri-s-salət:2/520" kitabında hədis əhlindən olan bir toplum insanın məzhəbi haqqında demişdir: "Onlar demişlər: "Allah haqqında bilgi iman, Onun haqqında cəhalət küfr olduğu, habelə fərzlərə əməl etmək iman, onun nazil olmasından öncə onun haqqında cəhalət küfr olmadığı kimi onun nazil olmasından sonra onu bilməyən şəxs kafir olmur.Çünki Allah Öz Peyğəmbərini (salləllahu aleyhi və səlləm) səhabələrə göndərdiyi ilk dönəmdə onlar Allahı iqrar etmişlər.Onlar həmin dönəmdə sonradan onlara fərz ediləcək fərzləri yerinə yetirmirdilər.Ancaq onların bu işlər barədə bilgisizliyi küfr olmamışdır.Ardından Uca Allah onlara həmin fərzləri nazil etmiş və onların həmin fərzləri iqrar etmələri və onu yerinə yetirmələri iman olmuşdur.İnsan yalnız Allahın xəbərini təkzib etdiyi səbəbilə onu danarsa kafir olar.Ancaq əgər xəbər ona çatmazsa həmin şəxs onu bilmədiyi üçün kafir olmaz.Xəbər gəlib çatandan sonra müsəlmanlardan onu eşitməyən şəxs həmçinin cəhaləti səbəbilə kafir olmaz.Allah haqqında bilgisizlik isə hər bir halda küfrdür, xəbərin gəlişindən öncə və xəbərin gəlişindən sonra." İmamın sözləri burada bitir.Habelə Şeyxul-İslam ibn Teymiyyə onun bu sözlərini "əl-fətəva:7/325" kitabında nəql etmiş və bu sözlərə heç bir irad tutmamışdır.

Dedim: İmamın növbəti sözlərinə diqqət yetir "Allah haqqında bilgisizlik isə hər bir halda küfrdür, xəbərin

gəlişindən öncə və xəbərin gəlişindən sonra." Yəni, xəbərin nazil olmasından öncə yaxud Allahın xəbərini çatdıranın gəlişindən öncə yaxud xəbərin nazil olması lakin eşitmənin hasil olmamasından sonra və Allahın xəbərini çatdıranın gəlişindən sonra.Hüccətin çatması yaxud çatmamasından asılı olmayaraq müşrik, müşrik olaraq qalır.Ancaq insan, eşitmə amilinə dayanan digər şəri buyuruqlar haqqında eşitməyənə qədər kafir olmur.Lakin əgər həmin xəbər aşkar olub geniş vüsət tapar və dindən zəruri olaraq bilinərsə ona müxalif olan şəxs, bu halda cahil olmaq yolverilməz olduğu üçün cəhaləti, habelə öyrənməkdən və bu təməli bilməkdən üz çevirdiyi səbəbilə kafir olar.

8-İmam Muhamməd bin İshaq bin Mandəh "ət-təuhid:1/314" kitabında növbəti başlıqlı bölüm açmışdır: "Uca Allahı və Onun təkliyini bilmək məsələsində xəta edən müctəhidin inadkar mislində olması haqqında dəlilin qeyd olunması".Daha sonra imam "əl-Kəhf" surəsində gələn ayəni dəlil gətirmişdir.Buna bənzər sözləri yuxarıda imam Muhamməd bin Cərir ət-Təbəri söyləmişdir.

9-İmam Ubeydullah bin Batta əl-Ukbəri "əl-İbənətu-s-suğra:103-səh" kitabının müqəddiməsində növbəti sözləri qeyd etmişdir: "Müsəlmanların cahil qalmaları yolverilməz olan məsələlər.Uca Allah bu işləri zay edən şəxsləri üzürlü etməz, habelə O, buna müxalif olan və tənə edən şəxsə

baxmaz.Bunlar dinlə istehza edib yanlışlıq etdikləri zaman dəlili puç edilən şəxslərdir...v.s".

10-Əbu Ömər bin Abdul-Bərr "əl-cəmi` libəyənil ilmi va fədlih:10-11-ci səh" kitabında demişdir: "Bütün insanlara bu işlərdən fərz olan, insanın cahil qalması yolverilməz olan işlərdir.Bu fərzlər, dil ilə şəhadət gətirmək, qəlblə Allahın tək və şəriksiz, habelə bənzərsiz, doğub doğulmayan və tayı-bərabəri olmayan, hər şeyi yaradan, hər bir şeyin Ona tərəf qayıtdığını, dirildib öldürən, ölməz kamil həyatla səciyyələn olduğunu iqrar etməsi kimi bir sıra işlərdir.Əhli sunnədən bir toplum insanın etiqadına əsasən Uca Allah daimə sifətləri və adları ilə vəsf edilir, Onun əvvəlinin başlanğıcı, axırının sonu yoxdur.O, ərşə isteva etmişdir.Habelə Muhamədin (salləllahu aleyhi və səlləm) Allahın qulu və elçisi, peyğəmbərlərin sonuncusu oduğuna, əməllərin qarşılığı verilsin və iman və itaət səbəbilə səadət əhli cənnətdə, küfr və danma səbəbilə bədbəxtlər cəhənnəmdə qalsın deyə ölümdən sonra dirilişin haqq olduğuna, habelə Quranın Allahın kəlamı və orada olanın haqq və Allahdan olduğuna şahidlik etməkdir.

Sonra İslamın bir sıra buyuruqlarını qeyd etdikdən sonra demişdir: Bunu bilmək gərəkdir və insan bu işlərdə cəhalət səbəbilə üzürlü olmur.Buna misal, zina, sələmçiliyin haram olması və şərabın və donuzun haram olmasıdır...v.s."

11-Qirafi əl-Maliki "əl-furuq:2/150" kitabında demişdir: "Doxsan dördüncü fərq, cəhalətin üzr olmadığı şeylər haqqında qaydanı və cəhalətin üzr olduğu şeylər haqqında qaydanı bəyan edir.Bil ki, şəriət sahibi şəriətə dair müəyyən cəhaləti bağışlamış və bu cür vəsfə malik insanları əfv etmişdir.Habelə müəyyən cəhalətə görə cəzalandırmış və onu işlədən şəxsi əfv etməmişdir.İnsan üçün keçilən cəhalətin həddi, adətən qaçılması mümkün olmayan cahillikdir."

Nəhayət demişdir: "Bundan savayı olana gəldikdə isə, mükəlləf insan və cahilliyi səbəbilə bir şeyi işlədən şəxs xüsusi olaraq etiqadi məsələlərdə günah daşıyır.Belə ki, şəriət sahibi dinin əsaslarına dair etiqadi məsələlərdə çox sərt mövqe tutmuşdur.Bu səbəbdən, əgər bir insan Uca Allahın bir sifətinə dair yaxud dinin əsaslarından etiqad edilməsi vacib olan hər hansı bir məsələdə cəhaləti qaldırmaq üçün səy göstərib var-gücü ilə çalışar lakin həmin cəhalət aradan qalxmazsa məzhəblərdə məşhur görüşə əsasən həmin şəxs imanın bir hissəsi olan həmin etiqadı tərk etdiyinə görə günahkar və kafir olar və cəhənnəmdə əbədi qalar.Həmin şəxs son dərəcə səy göstərmiş lakin cəhalət insandan dəf olunmayacaq surətdə zəruri olmuşdur.Bununla belə insan bundan ötrü üzürlü olmamışdır."

12-Muhamməd bin Əli bin Hüseyn əl-Məkki əl-Maliki "əl-haşiyətu aləl furuq:2/163" kitabında iki cəhalət arasında olan fərq haqqında qaydanı qeyd etdikdən sonra demişdir:

“Bil ki, cəhalət iki növdür: Birinci növ: Şəriət sahibinin bağışladığı və həmin vəsfdə olanı əfv etdiyi cəhalət.Bu cəhalət növünün həddi, adət olaraq qaçılması mümkün olmayan hər bir şey bağışlanır.”

Nəhayət dedi: İkinci növ: “Şəriət sahibinin şəriətdə keçmədiyi və onu işlədəni bağışlamdığı cəhalət.Onun həddi: Qaçılmaz və ağır olmayan hər hansı bir şey bağışlanmır.Bu növ, dinin əsasları, habelə fiqhin əsasları və şaxəli məsələlərin bəzi növlərini şamil edir.”

Dedim: Tövhiddə olan cahillik ilə digər buyuruqlarda olan cahillik arasında fərq qoymaq xavaric və murciələrin sözlərindən fərqli olaraq Əhli sunnə vəl cəmaatın sözüdür. Çünki küfr, şirk, fasiqlik, zülm və cəhalətin bir qismi İslamdan çıxaran digər qismi isə günah baxımından daha aşağı olur.

İbnul-Qayyimin “əs-salət” kitabında apardığı araşdırmaya nəzər sal! İmam bu kimi bölgüyə dair söhbət açıb demişdir: “Habelə cahillik iki cür olur.Uca Allahın dediyi kimi küfr cahillik: *“Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər!”.*[37] Habelə küfr olmayan cahillik.Uca Allah buyurur: *“Allah yanında yalnız o kəslərin*

[37] əl-Əraf:199.

***tövbəsi qəbul olunar ki, onlar cahillik üzündən pis bir iş gördükdən sonra dərhal tövbə edələr."***[38]

**Nəhayət dedi: "Şirk, küfr, fasiqlik, zülm və cahilliyin necə İslamdan çıxaran küfrə və İslamdan çıxarmayan günaha bölündüyünə nəzər sal!".Sözləri burada bitir.**

---

[38] **ən-Nisə:18.**

2-Şeyxul-İslam (rahiməhullah) "şərhul umdə" kitabında namazı tərk edənin küfrünə dair söhbət əsnasında demişdir: "Əslində Allahın xəbərini yaxud əmrini rədd etməyin hər növü kiçik və ya böyük olması fərqinə varmadan küfrdür.Lakin bəzən elm yolları gizli qaldığı və şaxəli məsələlərdən olan xırda bir məsələ olduğu üçün həmin iş bağışlanır.Lakin aydınlığı ilə seçilib xəbərlər və əmrlərdə öz əksini tapan dinin dayağlarından olan məsələ fərqlidir." Şeyx Əbə Buteyn (rahiməhullah) dedi: "Yəni, onun bəzən bağışlanacağı deyilməz."

Dedim: Onun bu sözlərinə nəzər sal! Həmin sözlər öncə qeyd edilən sözlərə və nəql etdiyimə tamamilə uyğun gəlir. Yəni, müsəlmanın cahillik səbəbilə üzürlü olduğu məsələlər və cahilliyi səbəbilə üzürlü olmadığı məsələlər arasında fərq qoyulur.

Lakin bəzi insanlara şər`i buyuruqlardan olan incə məsələrə dair elm yolları gizli qalır.Belə halda cahil üzürlü olur.

Uca Allahın tövhidi, Onun ibadətdə təkləşdirilməsi və şirkə düşməkdən çəkinmə kimi məsələlər mükəlləfin cahil qalması yolverilməz olan ən əzəmətli və aşkar məsələlərdir. Onun elm yolları fitri əhdi-pehmandan bəri, habelə ağıl və eşitmə yollarından açıq-aşkardır.

Müxalif etiraz edərək demişdir: Məgər aləmdən təcrid olunmuş halda yaşayan şəxs risalətin çatmaması səbəbilə üzürlü deyil?!

Ona deyilmişdir: Məgər hər hansı bir şəxsin aləmdən təcrid olunmuş halda olması ağılasığan işdir? Göy aləmdəndir.Yer aləmdəndir.O, həmçinin aləmdəndir!!

Şeyx Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) ən müxtəsər kitablarından biri olan "sələsətul usul" kitabında demişdir: "Allahdan başqa hər bir şey aləmdir.Mən isə həmin aləmdən biriyəm."

Məgər bu aləmdən təcrid olunmuş şəxs Uca Allahın təkliyinə, habelə həmin kainatı yaradan xaliqin olduğuna dəlalət edən dəlildən məhrum qalmışdır? Məgər həmin şəxs Allahın yaradılışda olan məharəti və mükəmməliyinə baxmır?!

Bu səbəbdən, Allahın lənətinə gəlmiş firon Allahın rübubiyyətini inkar etdiyi zaman demişdir: *"Aləmlərin Rəbbi nədir?"*.[39] Musa (aleyhi-s-sələm) hər bir ağıl sahibinə açıq-aydın olan dəlillə cavab verib demişdir: *"Əgər yəqin inanacaqsınızsa, (bilin ki) O, göylərin, yerin və onların arasında olanların Rəbbidir!"*.[40] Habelə müşriklər Allahın təkliyini rədd edib peyğəmbərlərə etiraz etdikləri zaman onlara cavab verilmişdir: *"Bizi dəvət etdiyiniz barəsində də möhkəm bir şəkk-şübhə içindəyik!-demişdilər. Peyğəmbərləri də (onlara)*

[39] əş-Şuara:23.
[40] əş-Şuara:24.

*belə cavab vermişdilər: "Göyləri və yeri yaradan Allaha da şübhə etmək olarmı?!".*[41]

**Buna dair şair buyurur:**

**Hər bir şeydə onun nişanəsi var**

**Onun Bir olduğuna bir dəlildir**

**İnsan hətta öz yaradılışı və əzalarında Allahın təkliyi və rübubiyyətinə dair dəlildən məhrum deyil.**

[41] İbrahim:9-10.

3-Şeyxul-İslam (rahiməhullah) “ər-risalətu-s-sunniyyə” kitabında xəvariclərə rəddiyə verərək demişdir: “Peyğəmbərin və onun xəlifələrinin dönəmində böyük ibadətinə rəğmən dindən çıxan şəxslərin olması bilinəcəyi zaman, bəlli olacaq ki, bu dönəmdə İslama mənsub olan insanlar bəzən həmçinin dindən çıxırlar.Buna səbəb, şeyx Adiyy kimi bəzi şeyxlərə dair ifrata varmaq, üstəlik Əli bin Əbu Talibə qarşı ifrata varmaq, üstəlik Məsihə dair ifrata varmaq kimi Uca Allahın pislədiyi ifratdır.Hər hansı bir peyğəmbərə yaxud saleh kişiyə qarşı ifrata varıb ona Allahdan başqa dua edib: Ey filankəs ağa mənə yardım elə yaxud məni islah elə yaxud sənə təvəkkül etdim yaxud sən mənə kifayət edərsən,-deyərək ona ilahi keyfiyyətlər verən şəxsin etdikləri bütün bu işlər şirk və küfrdür.Həmin insan tövbəyə çağırılar.Əgər o, tövbə etməzsə öldürülər.Uca Allah, ibadətin yalnız Ona olunması və Onunla bərabər başqa ilahın qəbul olunmaması üçün peyğəmbərlər göndərmiş və kitablar endirmişdir.” (əd-duraru-s-səniyyə: 9/245)

Dedim: Budur Şeyxul-İslam burada böyük şirkə düşmüş şəxsin küfrünə dair mütləq ifadə işlədir və bunu cəhalətin yoxluğu qeydinə bağlamır.Zamanında Nəcd diyarının muftisi olmuş şeyx Abdullah Əbə Buteyn (rahiməhullah) Şeyxul-İslamın bu və digər sözlərinə izah verərək demişdir: “Şeyx (rahiməhullah) bir çox yerdə qeyd etdiyimiz şirkin növlərini edən şəxsin küfrünə əminlik ifadə etmiş və buna dair müsəlmanların icmasını hekayət edərək cahil və bu kimi şəxsləri istisna etməmişdir.Uca Allah buyurur: *“Şübhə yoxdur ki, Allah Özünə şərik qoşmağı bağışlamaz, amma*

*istədiyi şəxsin bundan aşağı olan günahlarını bağışlayar."*[42] Habelə Uca Allah İsa peyğəmbərin belə dediyini xəbər vermişdir: *"Allaha şərik qoşana Allah, şübhəsiz ki, cənnəti haram edər.Onun düşəcəyi yer cəhənnəmdir."*[43] Əgər biri təhdidin xüsusi olaraq inadkar üçün gəldiyini deyib cahili, yozanı və təqlidçini çıxararsa Allaha və Peyğəmbərinə zidd gəlmiş olar və möminlərin yolundan çıxmış olar.[44] Fəqihlər

---

[42] ən-Nisə:48.

[43] əl-Maidə:72.

[44] Təəccüblü odur ki, tövhiddə cahilin üzürlü olduğuna dair icma iddiası ilə çıxış edən insanlar tapılmışdır. Hətta bəzən onlar tövhiddə cahilliyin üzr olmadığına dair sözü mötəzililərə nisbət edirlər.Əslində isə tövhiddə cahilliyin üzr olmaması mötəzililərin sözü olaraq bilinmir.Belə ki, hafiz ibn Qudəmə "ər-rauda:2/410-419" kitabında mötəzililərin imamlarından biri olan Cahiz əl-Mötəzilinin belə dediyini nəql edir: "Əgər biri araşdırıb haqqı dərk etməyə aciz olduğu zaman İslam ümmətinə müxalif olarsa üzürlü olar və heç bir günah daşımaz." İbn Qudəmə dedi: "Cahizin dediyi sözlər qəti olaraq batildir, habelə Allaha küfr etmək və Onu və Peyğəmbərini rədd etməkdir.Biz qəti olaraq bilirik ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) yəhudi və nəsranilərə və onların davamçılarına İslamı əmr etmiş və onların küfr üzərə israrla durmalarını pisləyərək onların hamısına qarşı savaşmışdır.Habelə bilirik ki, haqqı bilib inad edən insanlar azlığı təşkil edir.Əslində çoxluq atalarının dinini etiqad edən təqlidçilərdir. Onlar Peyğəmbərin möcüzəsi və doğru olduğunu bilməmişlər.Qurani Kərimdə buna dəlalət edən ayələr çoxdur. Uca Allah buyurur: *"Bu kafirlərin zənnidir"* (Sad:27). Habelə buyurur: *"Sizin öz Rəbbiniz barəsində bu zənniniz size məhv etdi və siz ziyan çəkənlərdən oldunuz."* (Fussılət:23) Habelə buyurur: "*Onlar yalnız zənnə qapılırlar*".(əl-Cəsiyə:24) Habelə buyurur: "*De: Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər haqqında ki, onların dünya həyatındaki səyləri boşa çıxmışdır.Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gümanında idilər.*" (əl-Kəhf:103-104) Ümumən elçiləri təkzib edənləri pisləmişdir.Bu cür ayələr Quran və sunnədə çərçivəyə sığmayacaq qədər çoxdur." Bitdi.

Bu, mötəzililərin imamlarından biri tərəfindən bu etiqada dair tutduğu mövqedir.Üstəlik əş-Şəhrastəni "əl-miləl va-n-nihal:1/75" kitabında Cahizin tövhiddə cəhaləti üzr gördüyünü qeyd etmişdir.

mürtədin hökmünə dair bölümü Allaha şərik qoşan şəxslə başlayır və bunu inadkar qeydi ilə bağlamırlar.Həmd olsun Allaha ki, bu, açıq-aydın bir məsələdir.” (əd-duraru-s-səniyyə fil əcvibəti-n-nəcdiyyə:11/246).

---

Kim mötəzililərin “الأصلح : daha yararlı” deyə məşhur olan dəyərsiz bir qaydasına və müşrik üçün daha yararlı olanın əzab olduğuna əsaslandığını zənn edərək tövhiddə cahilliyi üzr görməyən şəxsi mötəzililərə nisbət edərsə böhtan atmış olar və bu görüşün sahiblərinə iftira yaxmış olar.Əslində bu görüşdə olan insanların əsası, müşrikin kafir olduğuna və onun inadkarlıq, təkzib, cahillik yaxud təqlidçilik etməsi fərqinə varmadan cəhənnəmdə əbədi qalacağına hökm çıxaran ümumi nasslardır.Mötəzililər isə bunun əksini demişlər.Artıq Cahizin buna dair sözləri qeyd edilmişdir.Bunun meydana gəlməsinə səbəb, mötəzili və əşarilərin mükəlləfə ilk vacib olan məsələsində firqələr içində ən çox ziddiyətdə olan firqələr olmalarıdır.İlk vacib olan araşdırma və dəlil gətirmədir yoxsa qəsd etmədir yoxsa şübhədir yoxsa bilgidir? Habelə onların sözləri “təhsin və təqbih” mövzusu ilə bağlıdır.Dörd məzhəb alimlərindən bəziləri onların bəzi sözlərinə müvafiq gələn sözlər demişlər.Bütün bu işlərdə ixtilafın meydana gəlməsində başlıca səbəb onların, insanların üzərində olan hüccətə dair ixtilafda olmalarıdır.Görəsən hüccət yalnız ağıl ilə qalxır yoxsa yalnız eşitmə amili ilə yoxsa ağıl, eşitmə və fitrət ilə birgə olur? Birinci, mötəzililərin və onlara müvafiq gələnlərin görüşüdür.Habelə bu görüş bəzi hənəfi və hənbəlilərə nisbət olunur.İkinci isə, əl-Əşari və Malik, Şafii və Qadı Əbu Ya`lə kimi Əhmədin əshabından ona (Əşariyə) müvafiq gələnlərin görüşüdür.Üçüncü isə Əhli sunnənin görüşüdür. Onlar ağılın, eşitmə amilinin və fitrətin mükəlləflərin üzərində hüccətlər olduğunu deyirlər.Habelə bu hüccətlərdən hər birinin özünə münasib məqamı vardır.Bu səbəbdən, Quran və sunnənin bu mövzuda nasslarının müxtəlif olduğunu görə bilərsən.Bəzi tayfalar üçün vasitəsilə kainatı dərk etdikləri ağılları və hissiyat orqanları dəlil gətirilir. Digər tayfalar üçün isə onlara göndərilən peyğəmbərlər dəlil gətirilir.Başqa tayfalar üçün isə Allahın onlardan aldığı fitri əhdi-pehman dəlil gətirilir.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) “dər`u təarudil aqli va-n-nəql” kitabında, ələxsus səkkizinci cilddə və doqquzuncu cildin əvvəlində bu məsələyə geniş yer ayırmışdır.Məsələni geniş bilmək istəyən bu kitaba müraciət etsin.

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir: "Şeyxin sözləri mürtədliyə dair deyil və istər usul yaxud furu məsələləri olsun sadəcə cüzi məsələləri şamil edir." (məcmu` rasəilih:5/221).

Habelə şeyx Abdullah Əbə Buteyn (rahiməhullah) Şeyxul-İslam ibn Teymiyyənin (rahiməhullah) bu mövzuda məzhəbini araşdırarkən demişdir: "Şeyx Təqiyyuddinin sifətlərə dair seçdiyi məzhəbi cahilin kafir olmamasıdır.Şirk və bu kimi işlərdə isə fərqlidir." (əd-duraru-s-səniyyə:11/242).

Habelə şeyx öncə qeyd olunan mənbədə "11/241" demişdir: "Yozum yaxud ictihad yaxud təqlid yaxud cəhalət səbəbilə küfr edənin üzürlü olduğunu iddia edən heç şübhəsiz ki, Quran, sunnə və icmaya müxalifdir.Bununla bərabər onun öz təməlini pozması labüddür.Çünki əgər o, məsələn Muhammədin (salləllahu aleyhi və səlləm) risalətinə və bu kimi işlərə dair şübhə edənin təkfirində dayanmaq kimi öz təməlini ümumiləşdirərsə kafir olar.

Dedim: Görəsən əgər şeyx bu əsrdə həmin təməli ümumiləşdirib: Allahı, peyğəmbəri və İslamı söymək və axirəti inkar etmək olarsa belə fərq etməz əgər biri cahil olduğu halda hər hansı formada küfr edərsə üzürlüdür,- deyəni görsəydi necə olardı?! Üstəlik onlar nəsrani, yəhudi və digər ümmətlərin cahillərinin üzürlü olduğuna dair təməllərini ümumiləşdirib onlara risalət haqqında xəbərin gəlib çatmadığını iddia edirlər.

Şeyx Abdullah Əbə Buteyn (rahiməhullah) öncəki mənbədə "11/230" demişdir: "Əgər böyük şirk edən cəhaləti səbəbilə üzürlü olsaydı, elə isə üzürlü olmayan kimdir?! Bu iddia, Uca Allahın yalnız inadkarın üzərində hüccətə sahib olduğunu gərəkdirir.Bununla bərabər bu iddianı irəli sürənin öz təməlini ümumiləşdirməsi mümkün deyil.Əksinə onun ziddiyətə düşməsi qaçılmazdır.Çünki onun Muhammədin (salləllahu aleyhi və səlləm) risalətinə yaxud qiyamət gününə yaxud əqidənin digər əsaslarına dair şübhə edənin təkfirində dayanması mümkün deyil.Şübhə edən isə cahildir.Fəqihlər fiqh kitablarında mürtədin hökmünü qeyd edib deyirlər: "İslama girdikdən sonra söz yaxud hərəkət yaxud şübhə yaxud etiqad ilə kafir olan müsəlman." Şübhənin səbəbi cahillikdir.Belə olan halda bizim cahil yəhudi və nəsraniləri, habelə cahillikləri üzündən günəşə, aya və bütlərə səcdə edənləri, habelə Əli bin Əbu Talibin odda yandırdığı şəxsləri təkfir etməməyimiz gərəkdir.Çünki biz qəti olaraq bilirik ki, onlar cahildirlər.Artıq müsəlmanlar, yəhudi və nəsranilərin və onların küfründə şübhə edənlərin küfrünə dair icma etmişlər.Biz onların çoxunun cahillər olduqlarını yəqin bilirik."

Bu sözlərə Şeyxul-İslamdan qeyd edəcəyim dördüncü nəql güc qatacaq.

4-Belə ki, Şeyxul-İslam (rahiməhullah) “əs-sarimul məslul :127, min muxtəsar əl-bə`li” demişdir: “Hər kim səhabələri (ridvanullahi aleyhim) yaxud onlardan birini söyər və söyüşü ilə yanaşı Əlinin ilah yaxud peyğəmbər olduğunu yaxud Cəbrayılın xəta etdiyini iddia edərsə beləsinin küfründə heç bir şübhə yoxdur.Üstəlik beləsini təkfir etməkdə dayananın küfründə heç bir şübhə yoxdur.”

5-Habelə Şeyxul-İslam “128-səh” demişdir: “Kim on yaxud on beş nəfəri adlamayan az bir adam istisna olmaqla səhabələrin Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) sonra mürtəd olduqlarını yaxud onların fasiq olduqlarını iddia edərsə bunu deyən şəxsin küfründə heç bir şübhə olmaz. Üstəlik onun küfründə şübhə edən şəxs özü kafirdir.”

Şeyx Abdullah Əbə Buteyn (rahiməhullah) bu sözləri izah edərək demişdir: “Şübhə edəni necə təkfir etdiyinə nəzər yetir! Şübhə edən isə cahildir.Bununla da, bu kimi işlərdə cahilliyi üzr görməmişdir.” (əl-məsəil va-r-rasəilu-n-nəcdiyyə:5/517).

Dedim: Bu, şeyx Təqiyuddinin (rahiməhullah) tövhiddə cahilin hökmünə dair açıq-aydın məzhəbidir.Hüccətin qaldırılması isə yalnız sifətlər və bu kimi məsələlərdən olan gizli məsələlərdə mötəbər sayılır.Şeyx Əbə Buteyn “əl-məsəil va-r-rasəilu-n-nəcdiyyə:5/515-516” demişdir: “Şeyxul-İslamın bir çox insanlar üçün gizli qalan işlərdə hüccətin anlaşılmasını hesaba alması deyilsə belə burada bəzi sifətlərə

dair cəhalət kimi tövhid və risalətə zidd gələn işlər yoxdur.Tövhidə və risalətə iman məsələsinə zidd gələn işlərə gəldikdə isə, artıq Şeyxul-İslam (rahiməhullah) bir çox yerdə həmin işləri edənlərin kafir olacağını və tövbəyə dəvət edildikdən sonra öldürüləcəklərini vurğulamış və onları cəhalət səbəbilə üzürlü etməmişdir.Biz isə əminik ki, bu işlərə düşməyin səbəbi yalnız həmin işlərin gerçəyinə dair cahillikdir.Əgər onlar həmin işlərin İslamdan çıxaran küfr olduğun bilsəydilər onu etməzdilər."

Habelə şeyx Abdullah Əbə Buteyn (rahmətullahi aleyhi) öncəki mənbədə "5/520" Şeyxul-İslamın yuxarıda qeyd olunan sözlərini gətirdikdən sonra demişdir: "Onun gizli məsələlər ilə aşkar işlər arasında qoyduğu fərqə nəzər yetir!O, küfr olan gizli məsələlərə dair demişdir: Bəzən deyilə bilər ki, həmin şəxs, üzərindən sahibini kafir edən hüccət qalxmayan xətakar və azmışın birisidir.Onun sözlərində aşkar və gizli məsələlər arasında açıq-aydındır fərq qoyulur.O, mütləq hökm olaraq aşkar məsələlərə və bildirişdən sonra haramı halallaşdırma yaxud şirk olan fel və ya söz kimi cahilliyindən ötrü müsəlmanın etdiyi hərəkətə görə təkfir edir.Ancaq bəzi sifətlərə dair cəhalət kimi gizli məsələlərə görə təkfir etmir.O, bir insan həmin işə çağıran olarsa belə mütləş şəkildə cahili buna görə təkfir etmir.Buna misal, onun cəhmilərə dediyi sözlərdir: "Siz cahil olduğunuz üçün mənə görə kafir deyilsiniz." Şeyxul-İslamın burada "mənə görə" sözləri, bu

məsələdə (onların təkfir edilməsi məsələsində) icmanın olmadığını bəyan edir.Lakin bu, şeyxin seçdiyi mövqedir. Onun bu məsələ ilə əlaqədar sözünə dair məzhəbdə məşhur ixtilaf vardır.Məzhəbdə səhih görüşə əsasən, Quranın məxluq olduğuna yaxud Allahın görüləcəyini rədd etməyə yaxud rafiziliyə və bu kimi sözlərə çağıran müctəhidin təkfir edilməsidir.Təqlidçi isə fasiq hesab olunur."

**Dedim**: Artıq mən sifətləri inkar edənlərin təkfir ediləcəyinə dair "iqamətul huccə val burhan alə kufri mən qalə bixalqil qurani va təhqiqi xurucihi minəl milləh" kitabında geniş danışmış və orada sifətləri inkar edənlərin küfrünə dair bütün alimlərin icma etdiklərini izah etmişəm.Bu, sələf arasında yekdil olan mövzudur.Habelə mən orada icmanın olduğunu deyən bir sıra alimləri qeyd etmişəm.Üstəlik Şeyxul-İslam ibn Teymiyyənin özü bu icmanı hekayət edənlərdən biridir.Həmçinin o, cəhmiyyənin təkfirinə dair imam Əhməddən iki rəvayət gətirənlərin sözlərini rədd etmiş və ondan gələn sözlərin cəhmiyyənin təkfirinə dair müxtəlif olmadığını müəyyən etmişdir.Lakin Şeyxul-İslam (rahiməhullah) həmin məsələnin gizli məsələlərdən olduğunu və həmin məsələdə dəvətçi inadkar istisna cahilin kafir olmayacağını hesab etmişdir.Çünki imam Əhməd Məmun və Mutəsımı təkfir etməmişdir.Bu arada imam Əhməd ibn Əbu Duad və bir sıra insanları təkfir etmişdir.Sələfin sifətləri inkar edənlərin, istər bunlar cahil yaxud inadkar olsunlar ümumi

şəkildə təkfir olunacağına dair sözləri açıq-aydındır. Üstəlik onlar belə şəxslərin küfründə şübhə edənlərin təkfir olunacaqlarını qeyd etmişlər.İstisna olaraq keçərli bir şübhə səbəbilə onları təkfir etməyənləri göstərmək olar.Beləsinin şübhəsi aradan qalxmayınca o, üzürlü olacaq.Lakin həmin şəxsin şübhəsi aradan qalxandan sonra o, sözündən qayıtmazsa təkfir olunacaq.

6-Şeyxul-İslam ibn Teymiyyə (rahmətullahi aleyhi) "əl-fətəva: 1/153" kitabında demişdir:"Bəzən təvəssül sözü deyildikdə üç şey qəsd edilir.Müsəlmanlar arasında yekdillik olan iki məsələ qəsd olunur.Birinci: Ona (Peyğəmbərə) iman və ona itaət ilə təvəssül olan iman və islamın əsası.İkinci: Onun duası və şəfaəti.Onun dua etdiyi və şəfaətçi olduğu şəxslər üçün bunun təvəssül olaraq faydalı olması həmçinin müsəlmanların yekdil olduqları məsələdir.Kim bu iki mənada gələn təvəssüldən birini inkar edərsə kafir və mürtəd olar.Həmin şəxs tövbəyə çağırılar.Əgər tövbə etməzsə mürtəd olaraq öldürülər.

Lakin ona iman və ona itaət ilə olan təvəssül dinin əsasıdır.Bu, həm xüsusi insanlar (elm əhli) həm də ümumən adi insanlar üçün İslam dinindən zəruri olaraq bilinən bir işdir. Bu səbəbdən, kim bu mənanı inkar edərsə onun küfrü həm xüsusi həm də digər insanlar üçün aşkar olar.

Onun duası, şəfaəti və müsəlmanların bu işlərdən yaralanmasına gəldikdə isə, bunu inkar edən şəxs həmçinin kafir olur.Lakin bu, birincidən daha gizlidir.Bu səbəbdən, əgər biri cəhaləti səbəbilə onu inkar edərsə ona bu məsələ izah edilər.Əgər o, inkar üzərə israrla durarsa mürtəd olar."

Dedim: Bu, dinin əsaslarını şamil edən məsələlər ilə gizli məsələlər arasında fərqin ortaya qoyulmasına dair Şeyxul-İslamdan sabit olan açıq-aydın sözlərdən biridir.

Birinci məsələ: Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman və itaət ilə təvəssül etməyi inkar edənin hökmü.Şeyxul-İslam beləsinin ümumi və ya xüsusi insanlardan olarsa belə təkfir olunacağını demiş və bu məsələdə cahili üzürlü saymamışdır.Çünki bu məsələ onun özünün qeyd etdiyi kimi "dinin əsasları və İslam dinindən olması zəruri olaraq bilinən məsələdir."

İkinci məsələ: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) duası və şəfaəti ilə təvəssül etməyi inkar edənin hökmü.Həmin şəxs kafirdir.Lakin bunun gizli məsələlərdən olması səbəbilə cahilə bu işi izah etmək lazımdır.Əgər o, bundan sonra israrla durarsa təkfir olunacaq.

Şeyxul-İslamın bu və digər sözləri, onun dindən zəruri olaraq bilinən və buna müxalifi kafir edən şeyin olduğunu inkar etdiyini iddia edənlərə ən böyük cavabdır.Əgər risalənin qısa oması istəyi olmasaydı onun bu kimi ifadələrə dair açıq-aydın sözlərini və Allahın dinindən adi insanlara və xüsusi dairə üçün zəruri olaraq bilinən və xüsusi insanlara deyil adi insanlara gizli qalan məsələlərin olduğunu nəql edərdim. Bəzi insanlar dindən olması zəruri olaraq bilinən işlər ilə bu cür səciyyələnməyən məsələlər yaxud dinin əsasları ilə dinin şaxələri arasında fərqin qoyulmasına dair Şeyxul-İslamın sözlərini yanlış anlamışlar.Lakin həmin məsələni burada şərh etmək münasib deyil.Müvəffəq edən Allahdır.

7-Şeyxul-İslam (rahiməhullah) "əl-fətəva:3/422" kitabında demişdir: "Əgər biri bəşər övladına dair onun ilah olduğunu etiqad edər yaxud ölüyə dua edərsə yaxud ondan ruzi, yardım və hidayət diləyərsə, habelə ona təvəkkül edərsə yaxud ona səcdə edərsə tövbəyə çağırılar.Əgər o, tövbə etməzsə onun boyunu vurular.Habelə şeyxlərdən birini Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) üstün sayar yaxud hər hasnı bir şəxsin Allaha itaət etməkdən azad olduğunu etiqad edərsə tövbəyə çağırılar.Əgər tövbə etməzsə onun boyunu vurular.Həmçinin əgər biri, Xıdırın Musa ilə birgə olduğu kimi Allahın övliyalarından birinin Muhamməd (salləllahu aleyhi və səlləm) ilə birgə olduğunu etiqad edərsə tövbəyə çağırılar.Əgər tövbə etməzsə onun boyunu vurular.Çünki Xıdır Musanın ümmətindən olmamış və onun Musaya itaət etməsi vacib olmamışdır."

Bir qədər sonra demişdir: "Muhamməd (salləllahu aleyhi və səlləm) isə bütün insanlar və cinlər üçün göndərilmişdir.Bu səbəbdən, əgər biri hər hansı bir şəxsin onun şəriəti və itaətindən çıxmaq haqqına sahib olduğunu etiqad edərsə kafir olar və onu qətlə yetirmək vacib olar."

Dedim: Budur Şeyxul-İslam bu kimi sözləri deyənin küfrünə dair mütləq söz söyləyir və bu işlərdən heç bir şeyi hüccətin çatması yaxud cəhalətin üzr olması qeydi ilə bağlamır.Əgər o, bu sözləri deyən üçün cəhalətin üzr olduğunu hesab etsəydi bu sözləri deyən sufilər və qeyrilərinin tək-

firindən çəkindirmək və yanlış fikiri dəf etmək üçün buna diqqət çəkərdi.Əgər Şeyxul-İslam bu sözləri deyənlərin küfrünə dair mütləq şəkildə söz işlədirsə, belə olan halda Allahı yaxud Peyğəmbəri yaxud İslam dinini söyən yaxud Bədəvinin kainatı idarə etdiyini, kainatın altı qütbdən ibarət olduğunu və həmin qütblərin kainatı idarə etdiklərini, göylərin və yerin açarlarının onların əllərində olduğunu, habelə şərin onların vasitəsilə dəf edildiyini, xeyirin isə onların vasitəsi ilə cəlb edildiyini etiqad edən şəxslər tək bundan daha böyük küfr deyən haqqında nə demək olar? Üstəlik Allahın rübubiyyətini danıb yalnız təbiətə ibadət edən, dirilişi, həşr olunmağı və sorğu-sualı inkar edən şəxs necə üzürlü ola bilər? Allahdan qorx ey müsəlman qardaşım və dininə zərər gətirən və ona mənfi təsir göstərən hər bir işdən uzaq dur! Çünki sənin dinin sahib olduğun ən qiymətli şeydir.Ola bilsin ki, sən bunlardan birinin küfrünü inkar edəcəyin zaman onlar mislində olasan.Şübhəsiz ki, şeyx Abdullah bin Əbə Buteynin, tövhidin təməlində cəhaləti üzr sayan şəxsin öz əsasını hər bir xırda və nəhəng küfr üçün ümumi etməli olduğuna dair sözü doğru olmuşdur. Çünki əgər belə olarsa, bununla o və birinci kafir hal etibarı ilə eyni olarlar.Va lə haulə va lə quvvatə illə billəh!

8-Şeyxul-İslamın atası Əbul Mahasin Abdul-Halim bin Abdus-Sələm fiqhin əsaslarına dair "əl-musəvvidə:410" adlı kitabında tövhiddə təqlid məsələsi və onun icazəli olmadığına dair demişdir: "Bu səbəbdən, icmanın bağlandığı zahiri əhkamları danan şəxs avam olarsa belə kafir olur.Gizli olan isə fərqlidir.Təkfirə dair ikisi arasında fərq qoyulduğu kimi təqlidə dair həmçinin fərq qoyulur." Şeyxul-İslam bu sözləri dəstəkləyərək demişdir: "Məhz bu cür Əbul Xattab demişdir: "Təqlidin icazəli olmadığı işlər, Allahı və Onun təkliyini bilmək, habelə peyğəmbərliyin doğru olduğunu bilməkdir.O, qeyd etmişdir ki, avam insan ifadə etmək gücündə olmasa belə hər bir şəxs bu üç əsasa dair olan dəlilləri ağılı və elmi ilə bilir."

Bir qədər sonra demişdir: "Həmçinin beş namaz, Ramazan orucu, həcc və zəkat kimi ibadətlərin əsasları. İnsanlar bu ibadətlərdə təqlid etməyin icazəli olmadığına icma etmişlər.Çünki həmin ibadətlər mütəvatir xəbərlərdə sabit olmuş və sələf və onlardan sonraki alimlərin hamısı bunu nəql etmişlər.Daha sonra Əbul Xattab avam insan üçün əsasları şamil edən məsələlələrdə təqlid etməyin caiz olmadığına dair sözlər söyləmişdir...".

Dedim: Bu, elm əhlinin qəbul etdiyi bir qaydadır. İcma ilə tövhiddə təqlid etmək olmaz.Bunu bir sıra şəxslər hekayət etmişlər.Əgər bir şəxs bu məsələdə ictihad edib

müxalif olarsa onun sözü mötəbər sayılmayacaq.Buna dair yuxarıda Xatıb əl-Bəğdədinin nəqli qeyd olunmuşdur.

Əbul Vafə ibn Aqil demişdir: "Avam insanın tövhid və nübuvvət məsələsində təqlid etməsi icazəli deyil.Dedi: Bu, fəqihlərin, habelə üsul və kəlam əhlinin məzhəbidir."

Həmçinin demişdir: "Onlar namazın vacibliyi və rükətlərin sayı kimi şəriətin əsaslarında təqlid etməyin icazəli olmadığına dair ixtilaf etməmişlər."

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) demişdir: "Əhməd dedi: "Yəginlik tələb edən və yalnız qəti dəlil ilə sabit olan işlərdə təqlid etmək olmaz.Lakin zənn üzərində qurulan və zənni dəlil ilə isbat olunan işlərdə təqlid icazəlidir.Qəti dəlilə dair ictihad edilməz." Bütün bu nəqllər Teymiyyə ailəsinin "əl-musəvvidətu fi usulil fiqh" kitabındandır.(408-ci səh).

Budur Şeyxul-İslam (rahiməhullah) hər hansı bir şəxsin tövhiddə təqlid etməsini caiz saymır və bu işdə onun cahilliyini üzürlü görmür.Belə olan halda onun, şirkdə təqlid etməyi caiz sayması və onu üzürlü görməsi necə ola bilər?! Müşriklərin əksəriyyəti təqlidçi cahillər olmuşlar.Uca Allah onların belə dediklərini xəbər vermişdir: *"Biz atalarımızı bir din üzərində gördük və biz də onların ardınca getdik! -deyirlər."*[45] Buna rəğmən Uca Allah onları bu amilə

[45] əz-Zuxruf:22.

görə üzürlü etməmişdir.Habelə Şeyxul-İslamın atasının sözlərinə diqqət yetir: "Bu səbəbdən, icmanın bağlandığı zahiri əhkamları danan şəxs avam olarsa belə kafir olur.Gizli olan isə fərqlidir." Habelə Şeyxul-İslamın necə onun sözlərinə izah gətirib bu sözlərdən heç bir şeyə irad tutmadığına, əksinə tövhidin eşitmə yolu ilə bilindiyi kimi ağıl vasitəsilə həmçinin bilindiyinə dair Əbul Xattabın sözləri ilə onun sözlərini dəstəklədiyinə nəzər yetir.[46] Artıq yuxarıda bu məsələ izah edilmişdir.

---

[46] Bu səbəbdən, imam Muhamməd bin Abdul-Vahhəb "sələsətul usul" risaləsində demişdir: "Sənə: Rəbbini necə tanıdın?-deyiləcəyi zaman cavab olaraq söylə: Onun ayələri və məxluqatı ilə!" Bu isə, Uca Allaha və Onun təkliyinə dəlalət edən əqli düşüncə ilə olur.Bu, fitri əhdi-pehmana müvafiq gələn amildir.

9-Habelə Şeyxul-İslam (rahiməhullah) Hüseyn və Nəfisə xanımın qəbirlərinə gedənlər haqqında demişdir: "Kim ölülərdən birinin, istər Nəfisə olsun istərsə də qeyrisi, qorxu içində olanı himayə etdiyini, məhbusu xilas etdiyini və onun havaic qapısı olduğunu deyərsə o, azğın müşrikdir. Əslində isə himayə edən, Özünün isə himayəyə ehtiyacı olmayan məhz Allahdır..." (məcmu`əl-fətəva:27/490).

10-Habelə Şeyxul-İslam (rahiməhullah) onun dönəmində Şamda olan Nuseyriyyə firqəsini ümumi şəkildə təkfir edərək demişdir: "Şam və digər diyarlardan gəlib duruz dağlarında məskən quran nuseyriyyə deyə adlanan bu tayfa və batini qaramitilər sinifindən olan başqa tayfalar yəhudi və nəsranilərdən daha kafir insanlardır.Üstəlik onlar bir çox müşriklərdən daha kafir insanlardır.Onların dini bərahimə dininə, habelə bütpərəslərin və dinsizlərin halına bənzəyir. Onların Muhamməddin (salləllahu aleyhi və səlləm) ümmətinə olan zərəri türk, fransız və digər kafirlərdən olan hərbi kafirlərin zərərindən daha nəhəngdir." (muxtəsarul fətəva lil-bə`li:473-cü səh).

11- Habelə Şeyxul-İslam (rahiməhullah) "dər`u təarudil aqli va-n-nəql:1/244" kitabında cəhmiyyənin küfrünün açıq-aşkar olduğuna dəlil gətirdiyi əsnada demişdir: "Əslində isə əgər yalnız ağılı işə salmaqla bilinən və nasslarda və icmada bəyan edilməyən incə mənalarda bəzi insanların xəta etdiyi fərz edilsəydi belə olan halda heç kəsin bu kimi şəxsi təkfir

və təfsiq etmək haqqı olmazdı.Ancaq aşkar və mütəvatir nassların isbat etdiyini inkar etmək fərqlidir.Çünki bu mövzuda xəta edən şəxs kafir olursa beləsi təkfir olunmağa daha layiqdir.”

Dedim: Öncəki nəqllər kimi bu nəqllər həmçinin Şeyxul-İslamın gizli və incə məsələlərdə müxalif olan, xəta edən və cahil ilə tövhid və Allahın ibadətdə təkləşdirilməsi kimi açıq-aşkar məsələlərdə müxalif olan, xəta edən və cahil arasında fərq qoyduğunu açıq-aydın göstərir.

12-Şeyxul-İslam (rahiməhullah) "iqtidau-s-sıratıl mustəqim: 259-cu səh" demişdir: "Bu üzdən əgər biri, "bismillər" deyərsə belə Allahdan qeyrisinə yaxınlaşmaq məqsədilə Allahdan qeyrisinə qurban kəsərsə haram olar.Məhz bu cür bu ümmətin münafiqlərindən bir tayfa qurbanlar, buxurlar və digər şeylərlə övliyalara və ulduzlara yaxınlaşmaq üçün edirlər.Belə şəxslər mürtəddirlər və onların kəsdikləri heç bir vəchlə halal deyil.Lakin kəsilən heyvanda iki mənfi amil yanaşı gəlir.Bu növdən, Məkkədə və qeyrisində cinlər üçün qurbanlar kəsən cahillərin etdiyidir.Bu səbəbdən, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) cinlər üçün kəsilən qurbanı qadağan etməsi rəvayət edilir."

Dedim: Şeyxul-İslamın burada Allahdan qeyrisinə qurban kəsənləri necə təkfir etdiyinə və buna cahillərin Məkkədə cinlər üçün qurban kəsmək kimi əməlləri misal gətirdiyinə diqqət yetir!Şeyxul-İslam onları cahillik səbəbilə üzürlü görməmişdir.

13-Habelə Şeyxul-İslam (rahiməhullah) “ər-raddu aləl əxnəi:32-ci səh” kitabında qəbirlərə dua haqqında sözlərdən sonra demişdir: “Məlum olduğu kimi bu, Peyğəmbərə və onun gətirdiyinə küfr etmək və aləmlərin Rəbbinə şərik qoşmaqdır.Peyğəmbərin bu əməllərə zidd olan din ilə gəl-diyini və onun, müxalifliyi qəbul etməyən haqq ilə gəldiyini bilən şəxs bunu etməz.Bunu yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yolundan cahil olan yaxud Peyğəmbərin (salləllahu aleyhi və səlləm) adi insanlar üçün göndərildiyini Peyğəmbərə tabe olmağa ehtiyacsız olan onun şeyxinin isə xüsusi dairə insanlardan olduğunu yaxud onların Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yolundan daha yaxşı yola sahib olduqlarını hesab edən tək Allaha aparan yolda Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabeçilikdən savayı yol tutan birisi edir.Bunların hamısı kafirdirlər.”

Dedim: Bu, Şeyxul-İslamın açıq-aydın sözlərindən biri-dir.O, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yolu haqqında cahil olacağı halda belə şirk edən şəxsi təkfir etmiş və cahilliyi insandan küfrü dəf edəcək üzr etməmişdir.

14-Habelə Şeyxul-İslam öncəki mənbədə “81-ci səh” demişdir: “Bidət əhli və cahillər Allaha və Peyğəmbərinə əziyyət verən müxtəlif növ işlər edir və Allahın əmr etdiyi hüquqları, Onu təzim etdiklərini zənn etdikləri halda tərk edirlər.Onlar, nəsranilərin Məsihə qarşı həddi aşdıqları kimi edir və şeytan nəsraniləri azdırdığı kimi onları da azdırır. Onlar isə yaxşı işlər gördüklərini düşünürlər.Peyğəmbərlərin və saleh insanların qəbirlərini ziyarət edib onlara ibadət etmək və dua etmək üçün oranı qəsd edən şəxslər müşrikdirlər.”

Dedim: Bu, öncə nəql etdiyim tək açıq-aydın sözlərdir. Şeyxul-İslamın ilk öncə cahilliyi ardından isə şirki necə isbat etdiyinə diqqət yetir! O, həmin şəxslərin cahillik vəsfinə malik olmalarını onlar üçün üzr hesab etməmişdir.

15-Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) "dər`u təarudıl aqli va-n-nəql:1/27" kitabında dinin əsaslarından olub Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəyan etmədiyi və səhabələrin danışmadığı məsələlərin varlığını iddia edən şəxsə rəddiyə verdiyi əsnada demişdir: "Belə ki, dinin əsasları etiqad edilməsi vacib olan məsələlər yaxud da, tövhid, sifətlər, qədər, nübuvvət, axirət və ya bu məsələlərin dəlilləri kimi söz olaraq qeyd edilməsi və ya əməl edilməsi vacib olan məsələlərdir.

Birinci qism: İnsanların bu məsələlərdən bilməyə, etiqad etməyə və təsdiq etməyə ehtiyac duyduqları hər bir şeydir. Artıq Allah və Peyğəmbəri üzrü aradan qaldıracaq surətdə bunu kifayət qədər aydın bəyan etmişdir.Çünki bu, Peyğəmbərin insanlara təbliğ etdiyi və bəyan etdiyi ən əzəmətli işdir.Həmin iş, bunu bəyan edən və təbliğ edən peyğəmbərlərin, habelə səhabələrin sonra isə tabiinlərin Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) ləfzini, mənalarını, həmçinin Peyğəmbərin sunnəsində öz əksini tapan hikmətini nəql etdikləri Allahın kitabı vasitəsilə Uca Allahın qullarının üzərindən hüccət olaraq qaldırdığı ən əzəmtli amildir. Habelə onların Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) nəql etdikləri sunnə buna dair əsas məramı, habelə vacibin və müstəhəbin dolğun surətini şamil edir.Bizə özümüzdən olan və bizə Onun ayələrini oxuyan, bizi təmizləyən və hər bir şeyi izah edən və müsəlmanlar üçün hidayət, mərhəmət və müjdə olan kitabı öyrədən Peyğəmbər göndərən Allaha həmd olsun! *"(Bu Quran) uydurma bir söz deyildir.Ancaq*

*özündən əvvəlkilərin təsdiqi, hər bir şeyin müfəssəl izahıdır.O, iman gətirən bir tayfa üçün hidayət və mərhəmətdir!".*[47]

**Dedim: Bu, imamın aydın sözlərində biridir.Şeyxul-İslam bəyan etmişdir ki, məxluqatın üzərindən Qurani Kərimin bəyanı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) təbliği vasitəsilə tövhidə və dinin əsaslarına dair üzr qalxmışdır.Artıq bundan sonra hər hansı şəxsin bu əsaslara müxalif olmağa heç bir hüccəti qalmamışdır.Habelə Allahın açıq-aydın kəlamını və Peyəmbərin (salləllahu aleyhi və səlləm) sözlərini bəyan etmək üçün digər insanların izahını gərəkdirən gizli olduğu hesab olunan məsələ həmçinin qalmamışdır.**

**Şeyxul-İslam ibn Teymiyyə "dər`u təarudil aqli va-n-nəql:1/23" kitabının əvvəlində demişdir: "Peyğəmbər məxluqatın içində haqqı ən çox bilən, insanların içində haqqı bəyan etməyə ən bacarıqlı olan, və insanlara ən çox nəsihət edən şəxsdir.Bu isə onun haqqı bəyan etməkdə hər bir şəxsin bəyanından daha kamil olduğunu gərəkdirir."**

---

[47] **Yusuf:111.**

16-Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) "dər`u təarudil aqli va-n-nəql:8/487" kitabında müxtəsər qeyd etdiyim "əl-misaq" ayəsinə dair geniş şərhin əsnasında demişdir: "O, deyir: Xatırla ki, bir zaman onlar atalarının bellərindən çıxarılmış və dünyaya gəldikləri vaxt Yaradanı iqrar edərək və Allahın onların Rəbbi olduğuna dair öz əleyhinə şahidlik edərək fitrət üzərə yaradılmışlar.Bu iqrar, Allahın onların əleyhinə qiyamət günü olacaq hüccətidir.Allah onlara həmin hadisəni və onların öz əleyhinə şahidlik etmələrini xatırladır.Çünki Uca Allah yaratmış, gözəl biçimə salmış, təqdir etmiş və yolu göstərmişdir."

Habelə demişdir: "Bu isə, həmin şahidliyin insanın zəruri amillərindən olduğunu tələb edir.Belə ki, Uca Allah hər bir insanı, Onun rübubiyyətini iqrar edərək və özünün yaradılmış, yaradanın isə Allah olduğuna dair şahidlik edərək yaratmışdır.Bu, onlar üçün zəruri işdir və məxluqat ondan ayrılmazdır.Onlar bunun üzərə yaradılmış, habelə bu onların fitrətinə salınmış və onlar üçün zəruri elm edilmişdir."

Habelə demişdir: "Daha sonra dedi: *"Və ya: Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, biz də onlardan sonra gələn bir nəsil idik.Məgər bizi batilə uyanların törətdikləri əməllərə görə məhv edəcəksən?"- deməməniz üçündür."*[48] Uca Allah onların, həmin şahidliyin dəf etdiyi iki hüccətini qeyd etmişdir:

---

[48] əl-Əraf:173.

__Birinci__: *“Qiyamət günü: “Biz bundan qafil idik”,- deməməyiniz üçün”.*[49] Uca Allah bunun fitri, zəruri elm olduğunu və hər bir bəşər övladının bunu bilməli olduğunu bəyan etmişdir.Bu isə, Allahı danmağı puç etmək üçün Allahın hüccətini və Yaradanı isbat edən sözün fitri, zəruri elm olduğunu şamil edir.Bu, danmanı rədd edən hüccətdir.

__İkinci__: *“Və ya: Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, biz də onlardan sonra gələn bir nəsil idik.Məgər bizi batilə uyanların törətdikləri əməllərə görə məhv edəcəksən?”- deməməniz üçündür.”*[50] [51] Bu isə, şirki dəf edən hüccətdir.Birinci isə danmanı dəf edən hüccətdir.Danma, firon və onun mislində olanların küfrüdür.Şirk isə bütün ümmətlərdə olan müşriklərin şirkidir.

Uca Allah buyurur: *“Və ya: Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, biz də onlardan sonra gələn bir*

---

[49] əl-Əraf:172.

[50] əl-Əraf:173.

[51] Birinci ayədə Uca Allah buyurur: *“Qiyamət günü: “Biz bundan qafil idik”,- deməməyiniz üçün”.*Burada onların cahillik üzürünə son qoyulur.İkinci ayə: *“Və ya: Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, biz də onlardan sonra gələn bir nəsil idik.”* Burada onların təqlid üzürünə son qoyulur.Əslində bu, insanın nəfsi istəklərinə uyaraq və bir şeyi ona münasib olmayan yerə qoyması ilə zülm edərək baş verir.Bununla da, aləmin fəsada uğrama əsası bəlli olur.Yolunu azmış hər bir şəxsin zəlalətə düşməsi səbəbi iki səbəbdən biridir:Cahillik yaxud nəfsi istək.Cahilliyin şəfası imandır.Çünki o, iqrar, bilik və təsdiqdir.Nəfsi istəyi isə İslam müalicə edir.Çünki o, Uca Allaha tövhidlə təslim olmağı, Ona itaətlə boyun əyməyi və şirk və onun əhlindən uzaq durmağı ifadə edir.Buna dair digər yerdə geniş söz açmaq olar.Burada isə yalnız bu məsələyə qısa toxunmaqla kifayətlənirik.Artıq mən bu mövzunu bir qədər “əl-məhsul fi şərhi sələsətil usul” kitabında izah etmişəm.

*nəsil idik.Məgər bizi batilə uyanların törətdikləri əməllərə görə məhv edəcəksən?"- deməməniz üçündür."*[52] Onlar bizim müşrik atalarımızdır Sən də bizi başqalarının günahlarına görə cəzalandırısan!! Bütün bunlar həmin şəxslərin Allahın onların Rəbbi olduğunu bilmədikləri və atalarını müşrik olaraq gördükləri, onların isə sonraki nəsil olduğu fərz ediləcəyi haldadır.İnsanın adətən bilinən təbiəti onun atasının izlərinə düşməsini gərəkdirir.Onların fitrəti və ağıllarında isə buna zidd gələn heç bir amil yox idi.Onlar demişlər: Biz üzürlüyük!! Şirk qoşan bizim atalarımızdır.Biz isə sadəcə onlardan sonra gələn bir nəsilik.Biz onlara adətən bilinən bir təbiətin tələbinə uyğun tabe olmuşuq.Biz onların yanlış yolda olduqlarını bəyan edən heç bir dəlilə sahib deyildik.

Lakin onların fitrətində yalnız Allahın onların Rəbbi olduğuna şahidlik etdikləri amil olduğu zaman onlar həmin şirkin batil olduğunu bəyan edən amilə sahib olmuşlar. Bu isə onların öz əleyhinə şahidlik etdikləri tövhiddir.Onlar atalarına tabe olmaqdan ötrü adət halını dəlil gətirəcəkləri zaman həmin atalıq adətini ötən fitri və əqli təbiətdə öz əksini tapan dəlil onların əleyhinə olacaq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Hər uşaq fitrət üzərə doğulur.Daha sonra onun valideyinləri onu yəhudi, nəsrani və məcusiyə çevirirlər."

---

[52] əl-Əraf:173.

Beləliklə də, İslamı gərəkdirən fitrət onların dəlil gətirdikləri tərbiyəni ötmüş olur.Bu isə, vasitəsilə tövhidi bildikləri ağılın özünün şirkin batilliyinə dəlil olmasını tələb edir və peyğəmbərə ehtiyac duymur.Çünki O, öncə qeyd ediləni peyğəmbərsiz onların əleyhinə dəlil etmişdir."

Daha sonra Şeyxul-İslam (rahiməhullah) əqli, fitri dəlili və peyğəmbərlərin gəlişini bəyan edib demişdir: "Bu, Uca Allahın növbəti ayəsinə zidd gəlmir: *"Biz peyğəmbər göndərməmiş əzab vermərik."*[53] Belə ki, peyğəmbər tövhidə çağırır.Lakin əgər fitrətdə Yaradanın varlığını isbat edən əqli dəlil olmasaydı adicə risalət onların əleyhinə dəlil olmazdı. Allahın Rəbb olduğunu iqrar etməyi, bunun haqqında bilgini, habelə bilgi və şahidliyin hər bir Adəm oğlu üçün zəruri bir iş olduğunu şamil edən həmin şahidlik vasitəsilə peyğəmbərlərin təsdiq edilməsi məsələsində Allah onların üzərindən hüccəti qaldırır.Qiyamət günü heç bir şəxsin mən bundan qafil idim yaxud günah mənim deyil müşrik atamındır deməsi mümkün deyil.Çünki o, Allahın onun Rəbbi olduğunu bilir.Bu üzdən o, Allahı danmaq və Ona şərik qoşmaqda üzürlü olmamışdır.Artıq onun üzərindən onu əzaba layiq edən amil qalxmışdır."

Daha sonra Şeyxul-İslam (rahiməhullah) demişdir: "Habelə, insanlar məzəmət və cəzaya layiq olan işləri etsələr belə Uca Allah kamil mərhəməti və yaxşılığı ilə peyğəmbər

---

[53] əl-İsra:15.

göndərməmişdən öncə heç kəsi əzablandırmaz.Belə ki, ərəb müşrikləri və elçilər göndərilən digər tayfalar, məzəmmət və cəzaya səbəb olan pisliklər və çirkin işlər edirdilər.Uca Rəbb isə buna rəğmən onlara peyğəmbər göndərməmiş onları əzablandırmamışdır."

Dedim: Artıq Uca Allah peyğəmbərlərin sonuncusu olan Muhamməd Peyğəmbəri (salləllahu aleyhi vəsəlləm) bütün aləmlər üçün bir dəlil olaraq göndərmiş və onun gəlişi ilə hər bir şəxsin üzürü kəsilmişdir.Bununla da, öncəki əhdi-pehmanla birgə Allahın peyğəmbər göndərmək əhdi tamamlanmışdır. Onun gəlişi ilə Uca Allaha şərik qoşan hər bir şəxsin üzərindən bütövlüklə üzr kəsilmişdir.Lakin əgər biri ağılla heç bir əlaqəsi olmayan və sırf eşitməyə dayanan yasaq bir iş görər yaxud əmr olunan bir işi tərk edərsə belə olan halda hüccətin çatması şərt olar.Vəhyin tədriclə nazil olması halı buna misaldır.Uca Allah Beytul-Maqdisə yönəlik namaz qılanların üzərindən günahı aparmış üstəlik onlara əcri isbat etmişdir.Çünki Məscidul-Hərama tərəf namaz xəbəri onlara çatmamışdır.Məhz bununla, bir çox nasslarda xəbərin çatmaması səbəbilə üzürün olması məsələsinə dair varid olan dəlilləri müqayisə et! Tövhid və Allahın ibadətdə təkləşdirilməsi məsələsində hər bir şəxs üçün zəruri olan Allahın hüccəti əhdi-pehman, ağıl, fitrət, ətrafda Allahın ayələrinin müşahidə olunması və bütün təbəqələri şamil

edən peyğəmbərin gəlişidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Bu iş gecənin və gündüzün çatdığı tək çatacaq."

Haradadır yer üzündə elə bir yer ki, ora gecə və gündüz çatmasın və oranın əhli üzürlü olsun? Subhanəllahi-l-azım!

Artıq Uca Allah bütün məxluqatdan eşitmə, ağıl və fitrət dəlilləri ilə üzürü kəsmişdir.Bu, Allaha şərik qoşan şəxslərin üzürünü kəsərək Onun təkliyinə dəlalət edən üç rəbbani dəlillərdir.Daha ətraflı şəkildə:

1-Fitri hüccət: Onun dəlili, əhd ayələridir.Həmin ayələr Quranın bir sıra yerində təkrar-təkrar gəlir.Uca Allah buyurur: *"Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən (gələcək) nəsillərini çıxardıb onları özlərinə şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" -soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" -deyə cavab vermişdilər. (Belə bir şahidliyin səbəbi) qiyamət günü: "Biz bundan qafil idik",-deməməyiniz üçündür."*[54] Habelə digər ayələr.

Sunnədə, Əbu Ənəsin (r.a) rəvayət etdiyi səhih hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Uca Allah cəhənnəmdə ən yüngül əzab görəcək şəxsə deyəcək: Əgər sən yer üzündə olana sahib olsaydın onu (əzabdan qurtarmaq üçün) fidyə verərdinmi? Həmin şəxs: Bəli!-deyəcək.Uca Allah deyəcək: Sən Adəmin belində ikən mən bundan daha yüngül olanı səndən istədim.Mənə heç bir şeyi

[54] əl-Əraf:172.

şərik qoşmamağını istədim.Sən isə imtina edib Mənə şərik qoşdun."

**2-Əqli hüccət**: Onun dəlili həmçinin Quranın bir sıra yerində təkrar-təkrar gəlir.Uca Allah bir sıra yerdə buyurur: *"Məgər başa düşmürsünüz"*. *"Bəlkə başa düşəsiniz"*. Uca Allah, Onun yaradılışına nəzər yetirmək və onun haqqında düşünmək kimi işlərdən sonra onlar üçün rübubiyyətin dəlillərini gərəkli etmişdir.Uca Allah "əl-Mulk" surəsində buyurur: *"Onlar: "Əgər biz qulaq assaydıq yaxud ağlımızı başımıza yığsaydıq, cəhənnəm əhli içində olmazdıq!" - deyəcəklər."*[55]

**3-Risali hüccət**: Ona dair çoxlu dəlillər vardır.Uca Allah buyurur: *"Biz peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan olaraq göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!"*[56] Habelə Uca Allah buyurur: *"Ey cin və insan tayfası! Məgər sizə öz içərinizdən ayələrimi söyləyən və bu gününüzün gəlib çatacağı barədə sizə xəbərdarlıq edən peyğəmbərlər gəlmədimi? Onlar deyəcəklər: "Biz öz əleyhimizə şahidik!". Dünya həyatı onları aldatdı və onlar kafir olduqları barədə öz əleyhlərinə şəhadət verdilər."*[57] Habelə Uca Allah buyurur: *"Kafirlər dəstə-dəstə cəhənnəmə sürükləncəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və cəhənnəm gözətçiləri onlara deyəcəklər: "Məgər sizə öz*

---

[55] əl-Mulk:10.

[56] ən-Nisə:164.

[57] əl-Ənam:130.

*içərinizdən Rəbbinizin ayələrini oxuyan, sizi bu gününüzə qovuşacağınızla qorxudan peyğəmbərlər gəlməmişdi?" Onlar isə: "Bəli (gəlmişdi), lakin əzab sözü kafirlər barəsində vacib oldu!" -deyə cavab verəcəklər."*[58] Habelə buyurur: *"O, (kafirlərə olan) qeyzindən az qala parça-parça olsun. Hər hansı bir tayfa ora (cəhənnəmə) atıldıqca onun gözətçiləri onlardan (məzəmmətlə): "Məgər sizə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəlməmişdimi?" -deyə soruşacaqlar."*[59]

**Artıq bu ümmətə Allahdan bir qorxudan gəlmişdir.O, Peyğəmbərimiz Muhamməddir.O, onların üzərinə Allahın hüccətidir.Kim ona tabe olmağa müvəffəq olarsa qurtular, kim ona müxalif olarsa həlak olar.**

**Hüccətlərin çoxluğu Uca Allahın öz məxluqatına olan mərhəmətidir.Habelə tövhidin önəmli olması səbəbilə Allah həmin hüccətləri Onun üluhiyyətinə, rübubiyyətinə və kamiliyinə dəlalət edəcək tərzdə bir-birinə sıx bağlı etmişdir.Həmin hüccətlər vasitəsilə məxluqatın hüccəti kəsilir və artıq məxluqatın Allah yanında dəlil gətirəcəkləri heç bir hüccəti qalmır.**

**İbnul-Qayyim həmin hüccətləri "ən-nuniyyə" əsərində toplayıb demişdir:**

**İlahi vəhy, fitrət, ağıl amili**
**qəlbimdəki tamamlayır imanı**

**Şahidlik edir ki, Uca Rəbbimiz**

---

[58] əz-Zumər:71.
[59] əl-Mulk:8.

Birdir, Odur hər bir şeyin Sultanı

Haqq ilah Odur başqa ilah yoxdur

Ucadır böyük Rəbbimizin şəni

Peyğəmbərimiz Muhamməd (salləllahu aleyhi və səlləm) tövhidi ən kamil surətdə bəyan etmiş və ən aydın və dolğun tərzdə izah etmişdir.Üstəlik Qurani Kərim nazil olan zamandan bəri Peyğəmbər dəvətinin böyük hissəsini tövhidə və ona çağırışa həsr etmişdir.Belə ki, o, şirkdən çəkindirib tövhidi və onu bərqərar edən bütün İslam buyuruqlarını əmr etmiş, habelə bunu xütbələri və yazışmalarının əvvəlində və Arafat günündə olduğu kimi insanların toplaşdığı ən böyük aylarda və günlərdə xatırlatmışdır.Bu, onun ölüm anına qədər davam etmişdir. Hətta o, ölüm anında belə öz səhabələrini qəbirləri məscidlərə çevirməkdən çəkindirmişdir.

İmam əl-Həravi imam Şafiidən rəvayət edib demişdir: "Malik kəlam və tövhid haqqında soruşuldu.Malik dedi: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) ayaq yolundan təmizlənməyi öyrətdiyini lakin tövhidi öyrətmədiyini düşünmək ağılasığmazdır.Tövhid Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyidir: "İnsanlara qarşı, onlar "lə iləhə illəllah" sözünü deyənə qədər savaşmaqla əmr olundum." Malı və qanı qoruyan tövhidin gerçəyidir." (zəmmul kələm:176).

Bununla da, Allahın məxluqatı üzərinə hüccətləri tamamlanır və Onun kamil ədaləti üzə çıxır. *"Sənin Rəbbin*

*qullarına zülm edən deyildir!"*[60] Bu, Onun qullarına olan böyük mərhəmətindəndir.Hökm bütövlüklə Allaha məxsusdur.Uca Allah cənnət üçün sakinlər yaratmış və Öz lütfü ilə onlara, ora aparan yolu asanlaşdırmışdır.Fironun sehrbazları kimi onlar bütün ömrünü zəlalət üzərə yaşasalar belə onların son mənzili cənnətdir.Habelə cəhənnəm üçün sakinlər yaratmış və Öz ədaləti ilə onlara, ora aparan yolu asanlaşdırmışdır.Onlar iblis kimi haqq üzərə yaşasalar belə onların son mənzili atəşdir.Peyğəmbərdən buna dair gələn hədis buna açıq-aydın dəlalət edir. *"Onun hökmünü dəf edən olmaz".*[61] Onun hökmünə etiraz oluna bilməz. *"(Allah) gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar isə sorğu-sual ediləcəklər."*[62] Habelə buyurur: *"Əgər Rəbbin istəsəydi, yer üzündə olanların hamısı iman gətirərdi."*[63] Habelə buyurur: *"Əgər Biz istəsəydik, hər kəsi doğru yola salardıq."*[64] Habelə Uca Allah buyurur: *"De: Tutarlı dəlil yalnız Allaha məxsusdur. Əgər O istəsəydi, sizin hamınızı doğru yola yönəldərdi".*[65]

İbn Cərir (rahiməhullah) "əl-Ənam" surəsinin təfsirində "5/388" demişdir: "Uca Allahın növbəti sözünə dair izah: *"De: Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı? Siz*

---

60 əl-Fussılət:46.
61 ər-Ra`d:41.
62 əl-Ənbiyə:23.
63 Yunus:99.
64 əs-Səcdə:13.
65 əl-Ənam:149.

*yalnız zənnə qapılır və* ***yalan uydurursunuz!".*** **Uca Allah** Peyğəmbəri Muhammədə (salləllahu aleyhi və səlləm) deyir: Rəbbini qoyub başqa məbudlara və bütlərə tapınan və onlara əkin və davar heyvanlarını haram edib: *"Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik."*,-deyən və Allahın onların şirkindən və haram etdiyi işlərdən razı qaldığını iddia edənlərə de, ey Muhamməd! *"Bir elminiz varmı?".* Allahın, sizin Ona ibadətdə şərik qoşmağınıza və mallarınızı haram etməyinizə razı qaldığına dair Allaha nisbət etdiyiniz barədə üzürü aradan qaldıran şəxsin xəbərindən yəqin bir elminiz yaxud bizə yəqin elmi gərəkdirən hüccətmi var? *"Bizim qarşımıza çıxara biləcək".* Deyir: Sizin sözünüz və əməlinizin yanlış olduğuna və bunun ağıl və eşitmə amilinə zidd gəldiyinə və mümkünsüz olduğuna dair sizə bir sıra yerdə bəyan etdiyimiz kimi onu (elmi) bizim qarşımıza çıxarın və bəyan edin. *"Siz yalnız zənnə qapılır".* Allah ona deyir: Onlara de: Ey müşriklər! Sizin bu sözləri deməyiniz və müxtəlif məbudlara və bütlərə ibadət etməyiniz, habelə əkin və heyvanları haram etməyiniz yalnız zənn etdiyinizdən və onun haqq olduğunu və özünüzün haqq üzərə olduğunuzu hesab etdiyinizdən ötrüdür. Əslində isə o və sizin yolunuz batildir. *"Siz yalnız zənnə qapılır və yalan uydurursunuz!"."*

Əslində isə bu məsələ dindir. Əgər o, arzu və istək, habelə insanlara təqlid üzərində qurulsaydı bizim dinimiz-

də çaşqınlığa düşməymiz qaçılmaz olar və qəlblərimizə şübhə və əyrilik girərdi.Məhz bu səbəbdən, Uca Allah bizə Onun kitabında və Peyğəmbərinin (salləllahu aleyhi və səlləm) sunnəsində olan açıq-aydın və yeganə haqq olan sözə qayıtmağımızı əmr etmişdir.Uca Allah buyurur: *"Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!".*[66] Elm əhli demişlər: Allaha həvalə etmək, yəni Onun kitabına həvalə etmək.Peyğəmbərə (salləllahu aleyhi və səlləm) həvalə etmək isə, diri ikən ona müraciət etmək, öləndən sonra isə onun sunnəsinə qayıtmaqdır.

Uca Allah buyurur: *"Biz Kitabı sənə hər şeyi izah etmək üçün, müsəlmanlara da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!"*[67] Habelə buyurur: *"Ey insanlar! Sizə Rəbbiniz tərəfindən açıq-aydın dəlil gəlmişdir.Biz sizə aydın bir nur endirdik."*[68] Bu, onun vəsfləridir: Hər şeyi izah edən, möminlər üçün hidayət, məhrəmət, müjdə, Allahdan gələn açıq-aydın dəlil və aydın nur.Məgər bütün bunlardan sonra onun hər bir çəkişməyə son qoyan hakim olması deyilməyəcək?!

Peyğəmbərimiz Muhamməd (salləllahu aleyhi və səlləm) elə bir xeyir buraxmamışdır ki, bizi ona yönəltməsin.Habelə elə bir şər tərk etməmişdir ki, bizi ondan çəkindirməsin.O, Uca Allahın dediyi kimi Allahın dinini ən kamil surətdə çatdır-

---

[66] ən-Nisə:59.
[67] ən-Nəhl:89.
[68] ən-Nisə:173.

mışdır: *“Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq İslamı bəyənib seçdim.”*[69] Biz qiyamət günü onun haqqında soruşulacağımız zaman şahidlik edəcəyimiz məhz bu olacaq.Biz onun risaləti çatdırdığına, əmanəti yerinə yetirdiyinə, ümmətə nəsihət etdiyinə, bədbinliyi apardığına və Allah yolunda haqqı ilə cihad etdiyinə dair şahidlik edəcəyik.Kitabın axırıncı fəsilin-də iki şeyxin sözlərində bizə müxalif olan şəxslərin sevinclə qeyd etdiyi bəzi qaranlıq məqamları bir qədər ətraflı izah edəcəyik.Vallahul mustəan.

[69] əl-Maidə:3.

# Fəsil

# Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin tövhidin əsasında cəhalətin üzürlü olmadığına dair gələn açıq-aydın sözləri

Heş şübhəsiz ki, Şeyxul-İslam ibn Teymiyyənin yazdığı və həddindən artıq çox olan təlifləri, risalələri və fətvaları Allahın müvəffəq etdiyi az bir qism insanlar istisna olmaqla istənilən səviyyədə öz ehtimamını tapmamışdır.Hər bir halda Şeyxul-İslam ibn Teymiyyədən tövhidin təməlində cəhalətin üzr olmadığına dair nəql edilən çoxsaylı sözlərin ardından Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbdən bu məsələyə dair açıq-aydın sözlər nəql etməyin vaxtı gəlib çatmışdır.Qeyd edildiyi kimi həmin imamlardan gələn bir aydın ifadə məsələni kifayət gədər aydın izah edir.Lakin insanın zehnində möhkəmlənsin və məsələyə güc qatsın deyə burada mən bir sözü digər çoxsaylı sözlərlə yanaşı qeyd edəcəm.Bundan fərqli olaraq müxaliflər bəzi sözləri qapıb digər sözləri buraxırlar.Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin təlif etdiyi əsərlər cild-cild kitablarda toplanmışdır.Həmin təliflərin bir qismi hələ də çap edilməyib.Bu imamın yazdığı əksər mövzular tövhid və

əqidə məsələlərini şamil edir.Artıq o, bir çox risalə və təliflərdə tövhidin təməlində cəhalətin üzr olmadığını qeyd etmişdir.Üstəlik o bunu ən məşhur kitabları “kitəbu-t-təuhid”, “sələsətul usul”, “kəşfu-ş-şubuhat” kimi əsərlərdə qeyd etmişdir.Onun tövhid məsələləri və təkfiri gərəkdirən amillər haqqında sözlərinin çox olmasına rəğmən mən yalnız onun bu mövzuya dair bəzi aydın sözlərini nəql edəcəyəm.

1-Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) ən məşhur kitabı olan "kitəbu-t-təuhid əlləzi huva haqqullahi aləl abid" əsərində, növbəti ünvan altında demişdir: "Həlqə, sap və bu kimi şeyləri bəlanı aparmaq yaxud dəf etmək üçün taxmaq şirk sayılır." İmran bin Huseynin (r.a) hədisində gəlmişdir ki, Peyğəmbər (sallləllahu aleyhi və səlləm) bir kişinin əlində tuncdan olan həlqəni gördüyü zaman demişdir: Bu nədir? Həmin şəxs dedi: Zəiflikdən qoruyur.Dedi: Onu çıxart! Çünki o, yalnız sənin zəifliyini artırır.Əgər onunla ölsəydin heç vaxt nicat tapmazdın!" Əhməd məqbul isnadla rəvayət etmişdir.Şeyx (rahiməhullah) məsələlərdə demişdir: "Üçüncü: O, cəhalət səbəbilə üzürlü olmamışdır."

Dedim: Burada diqqəti çəkən əsas məqam: Peyğəmbər (salləllahu aleyhi və səlləm) xəbər vermişdir ki, əgər həmin şəxs bu hal üzərə ölsəydi etdiyi bu işə görə cəzalanacaqdı.Həmin şəxsin isə qəti olaraq bunun hökmü barəsində cahil olması bilinir.Əks halda o, həmin həlqəni qolundan asmazdı.

Hədis alimi şeyx Abdullah əd-Duveyş tövhid kitabının məsələlərini şərh edərkən demişdir: "Üçüncü: Onu cəhalət səbəbilə üzürlü görməmişdir.Çünki cahillik ehtimalının qalmasına rəğmən Peyğəmbər (salləllahu aleyhi və səlləm) ondan, bunu bildiyini yaxud bilmədiyini soruşmamışdır." (məcmu` muəlləfəti-ş-şeyx Abdullah bin Muhamməd əd-Duveyş: 1/26)002E

Bəzi alimlər bu əməli kiçik şirk saymışlar.Belə olacağı halda, bəlli olacaq ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) həmin şəxsi, qarışqanın yeriməsindən daha gizli olan kiçik şirkdə belə üzürlü etməmişdir.Elə isə, İslamdan çıxaran böyük şirk barədə nə demək olar?!

Şeyx Süleyman bin Abdullah (rahiməhullah) “teysirul azizil hamid:158-ci səh” kitabında demişdir: Ondan çıxan faydalardan: “Müsəlman günah edib günahdan ötrü pislənəcəyi ardından tövbə edəcəyi zaman bu (günah), ona zərər verməz.”

Tövhid kitabının bəzi şərhçiləri cahilliyin üzr olması məsələsini isbat etməyə çalışmışlar.Onlardan bəzisi burada cahilliyin üzr olmaması məsələsini hüccətin çatmasından sonraya aid etmişlər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə ona demişdir: “Əgər onunla ölsəydin”.Yəni, keçmiş zamanı şamil edir.Bu isə, məqsədin hüccətin çatmasından öncə olduğunu göstərir.Müasirlərdən bəzisi isə Şeyxul-İslamın xəta etdiyini açıq bildirmişlər.Vallahul mustəan.

2-Şeyx "zətul-ənvat" hədisinin məsələlərində demişdir: "Beşinci məsələ: Onlar bu haqda cahil olmuşlar.Başqaları isə cahillik vəsfinə daha layiqdirlər." Daha sonra dedi: "Yeddinci məsələ: Peyğəmbər (salləllahu aleyhi və səlləm) onları üzürlü etməmiş, üstəlik onların sözlərini "Allahu əkbər" ifadəsini işlətməklə rədd etmişdir."

Dedim: Şeyx (rahiməhullah) burada Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onları cəhalət səbəbilə üzürlü etmədiyini və onların sözlərinə "Allahu əkbər" sözünü deməklə irad tutduğunu qeyd edir. Onlar isə alimlərin yekdil rəyinə əsasən kafir olmamışlar.Elə isə əgər onlar "zətul ənvat" deyilən ağaca ibadət edib ibadətin hər hansı bir növünü ona yönəltsəydilər necə olardı?! Belə olan halda onların üzərindən üzr daha aşkar qalxardı.

**3-** Şeyxul-İslam (rahiməhullah) “kəşfu-ş-şubuhat” kitabında demişdir: “Habelə sənə böyük qorxu gətirəcək.Çünki sən insanın cahil olduğu halda küfr söz deyəcəyini və cəhaləti səbəbilə üzürlü olmayacağını biləcəksən.Bəzən insan həmin sözü deyir və müşriklərin zənn etdiyi kimi onun insanı Uca Allaha yaxınlaşdırdığını zənn edir.”

Dedim: Ağıl sahibi bunun Şeyxul-İslamın ən məşhur təliflərinin birində ondan sabit olduğuna və açıq-aydın nass olduğuna şübhə etmir.Görəsən cəhaləti üzürlü sayan şəxslər bu açıq-aydın sözləri necə rədd edəcəklər?!

4-Şeyx "kəşfu-ş-şubuhat" kitabının axırında növbəti ayədən sonra demişdir: *"Qəlbi imanla sabit olduğu halda məcbur edilən kimsə istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə"*[70] Dedi: Bunlardan yalnız qəlbi imanla sabit olduğu halda məcbur edilən kimsəni üzürlü etmişdir.Bundan savayı olan isə, istər qorxu yaxud yaltaqlıq yaxud vətənə, ailəyə və ya qəbiləyə və ya mal-mülkə bağlılığı yaxud zarafaca etdiyi yaxud digər məqsədlər səbəbilə olsun iman gətirdikdən sonra kafir olmuşdur.Məcbur edilən isə müstəsnadır."

Dedim: Uca Allah yalnız məcbur edilən istisna etmişdir. Əgər cahil həmin hökmdən müstəsna olaraq çıxarılsaydı Allah, Onun Peyğəmbəri və təfsir əhlindən olan alimlər bunu qeyd edərdilər.Şeyxul-İslam, İslamdan çıxaran böyük küfrə düşməkdə yalnız məcbur edilənin üzürlü olduğu səbəbilə dəfələrlə bu ayəni dəlil olaraq gətirmişdir.

[70] ən-Nəhl:106.

5-Şeyx (rahiməhulah) elm əhlinin icması ilə İslamdan çıxaran on amil haqqında bəhs edən "nəvaqidul islam" adlı kitabında demişdir: Onuncu amil: Allahın dinindən üz çevirib onu öyrənməmək və ona əməl etməmək. Buna dəlil olaraq, Uca Allah buyurur: "*Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz çevirən kəsdən daha zalım kim ola bilər?! Biz, şübhəsiz ki, günahkarlardan intiqam alacağıq!*".[71]

Nəhayət İslamı pozan amillər kitabının sonunda demişdir: "Bütün bu İslamı pozan amillərdə məcbur edilən istisna olmaqla əylənən, ciddi olan və qorxan arasında heç bir fərq yoxdur."

Dedim: Diqqət yetir! Şeyx burada cəhalətin gerçəyi və cəhalət və üz çevirmə kimi iki bəlanı cəm etdiyi səbəbilə onun ən çirkin təzahürü olan elmdən üz çevirməni necə vəsf etmiş və bunu həmin şəxs üçün üzr etməmişdir.Əgər müxaliflərin dediyi kimi cahillik üzr olsaydı insanın cahil olaraq öz ailəsi, heyvanatı, əkin sahəsi və peşəsində qalması daha yaxşı olar və insan hicrəti tərk etmək və öhdəçilik və vaciblər məşəqqətini yüngülləşdirmək üçün, habelə İslamın buyuruqlarını tərk etdiyinə, üstəlik bütlərə ibadət etmək kimi dini pozan amillər işlətdiyinə rəğmən cənnət müjdəsi almaq üçün cahilliyi üzərə qalması daha yaxşı olardı!! Çünki o, elm öyrənməmiş cahilin birisidir.Tövhidin əsasında cəhaləti üzr görənlər məhz bunu istəyirlər.Va lə həulə va lə quvvatə illə billəh.

---

[71] əs-Səcdə:22.

6-Şeyxul-İslam (rahiməhullah) İsa bin Qasim və Əhməd bin Suveylim qardaşlara yazdığı məktubda demişdir: "Siz həmin tağutlar və onların davamçıları haqqında soruşursunuz: Onların üzərindən hüccət qalxıbmı yoxsa yox? Bu, çox təəccüblü haldır.Siz buna necə şübhə edirsiniz ki, artıq mən dəfələrlə sizə izah etmişəm ki, üzərindən hüccət qalxmayan şəxs İslamda yeni olan yaxud uzaq bir çöllükdə yaşayan insandır yaxud bu, ayırma və qovuşdurma kimi gizli məsələlərdə olur.Beləsi anlatılmayınca təkfir olunmaz.

Allahın kitabında açıqladığı dinin əsaslarına gəldikdə isə, Allahın hüccəti Qurandır.Əgər birinə Quran çatarsa artıq ona hüccət çatmış olar.Lakin anlaşılmazlığın kökü sizin hüccətin qalxması ilə hüccətin anlaşılması arasında fərq qoymamağınızdır.Kafirlər və münafiqlərin üzərindən hüccətin qalxmasına rağmən onların çoxu Allahın hüccətini anlamamışlar."(məcmu` fətəva-ş-şeyx:5/244).

Dedim: Cahilliyi üzr görən şəxslərin çoxu bu təfsilatı gözdən qaçırır və Bədəvi, Aydərus, Ceyləni və digərlərinin qəbirlərinə sitayiş edənləri, onların həmin yolun tövhidə zidd gələn şirk olduğunu bilmədikləri əsası ilə onları üzürlü görürlər. Halbuki onlar Quranı oxuyur, üstəlik bəziləri Quranı əzbər bilir və onu gecə və gündüz tilavət edirlər.Uca Allah bu vəsfdə olan insanlar haqqında buyurur: *"(O gün) bir çox üzlər müti görkəm alacaq; Zəhmət çəkib yorulacaq, nəticədə isə yanar*

*oda girəcəkdir."*[72] Onların mütiliyi, əməli və zəhməti Allahın hüzurunda fayda verməyəcək.Çünki onlar müşrikdirlər.

Əsli kafir, inadkar yaxud cahil olarsa belə onun küfründə heç bir şübhə yoxdur.İslama nisbət olunan şəxs, elmsizlik iddiasında olarsa belə onun Quranı oxumaması yaxud onun məramlarını bilməməsi onun üçün həmçinin üzr deyil.Bu, qeyd edildiyi kimi İslamı pozan amillərdən biri olan Allahın dinindən üz çevirməkdir.

Şeyximiz ibn Bəzdən (rahiməhullah) heyzli halda qadını ilə cinsi əlaqədə olanın günah daşıdığını eşitmişdim.Ona dedilər: "Ey şeyx! Həmin şəxs bunun hökmünü bilmədiyini və cahil olduğunu demişdir.Şeyx dedi: O, bunun üçün üzr deyil.Çünki artıq Quran ona çatmış və həmin hökm orada qeyd edilir.Onun bundan cahil qalması yolverilməzdir."

Şeyx bunu fər`i məsələdə demişdir.Dinin əsasları və tövhidin təməllərindən olan məsələ barədə nə demək olar?!

Şeyximiz ibn Bəz (rahiməhullah) qeyd etdiyim həmin əsas üzərə olmuşdur.Mən on il şeyxin çevrəsində olmuşam və ondan buna müxalif olan bir şeyə rast gəlməmişəm.Artıq mən şeyxə "kitəbu-t-təuhid" və "kəşfu-ş-şubuhat" kitablarını oxumuş, habelə dəfələrlə Nəcd və Hicazda digər insanların şeyxə bu kitabları oxuduğunu dinləmişəm.Şeyx həmin məsələyə dair müəllifin sözlərini təsdiqləmiş və buna müxalif olmamışdır.Habelə mən ondan dəfələrlə bu barədə soruşmuşam, şeyx isə yuxarıda vurğuladığım kimi cavab vermişdir.

---

[72] əl-Ğaşiyə:2-4.

Habelə mən bu məzhəbə dair yazılan ən güclü və ətraflı izah edilən kitablardan olan ibn Cərir ət-Təbərinin "məalimu-t-təbsir biməalimi-d-din" kitabını bütövlüklə şeyx üçün oxutdurmuşam.Şeyx isə araşdırma mövzusundan kənar olan az bir şey istisna olmaqla müəllifə heç bir irad tutmamışdır.

Əlxsus Şeyxul-İslam ibn Teymiyyə və Muhamməd bin Abdul-Vahhəbin sözlərində olduğu kimi şeyximiz ibn Bəzin (rahiməhullah) vəfatından sonra insanlar onun sözlərini nəql etmək və dəlil gətirmək məsələsində müxtəlif məsləklər tutmuşlar.Əslində isə şeyxin bu məsələdə məzhəbi ən məşhur kitablarında açıq-aydındır.Bu sözlərdən bəzisi:

Misirdən olan bir adam şeyxə sual verib demişdir: Bir insan ölülərdən yardım dilədiyi halda ölür.Həmin şəxs bildiyimə görə bunu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) məscidini ziyarət etdiyi zaman bir dəfə Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) yardım diləməsi istisna olmaqla bu kimi qadağan olunmuş işlər etməmişdir.Həmin şəxs bunun haram və şirk olduğunu bilmirdi.Daha sonra həmin şəxs həcc etmiş və düşünürəm ki, ölənəcən heç kəs ona bu barədə bir məlumat verməmiş və onun bu barədə heç bir bilgisi olmamışdır.Eyni zamanda həmin şəxs namaz qılıb Allahdan bağışlanma diləyən bir adam olmuşdur.Bununla belə həmin adam bir dəfə etdiyi işin haram olduğunu bilmirdi.Görəsən insan bir dəfə olsa belə bu kimi işləri cahil olduğu halda edib ölərsə, bu zaman müşrik sayılacaqmı? Sizin bu məsələyə açıqlama gətirməyinizi rica edirəm.Allah sizi xeyirlə mükafatlandırsın!

Şeyximiz (rahiməhullah) cavab verib demişdir: "Əgər qeyd etdiyin adam həmin bir dəfə baş vermiş işdən Allaha tövbə

edib Uca Allaha tərəf qayıtmış və bu əməldən ötrü istiğfar etmişdirsə belə olan halda bunun hökmü aradan qalxır və onun İslam hökmü sabit olur.Lakin insan Allahdan başqa yardın diləmək kimi (şirk) etiqad üzərə davamiyyətli şəkildə qalıb bundan tövbə etməzsə o, şirk olan əməldən Allaha tövbə etməyincə namaz qılıb oruc tutsa belə şirk üzərə qalacaq.

Nəhayət dedi: Əslində əgər biri şirk üzərə ölərsə onun üçün bağışlanma dilənməz, dua edilməz və onun üçün sədəqə çıxarılmaz.Ancaq onun şirkdən tövbə etməsi bilinərsə fərqli olar.Elm əhlində məşhur olan qayda məhz budur.Müvəffəq edən Allahdır." (bu fətva "məcəllətul buhusil isləmiyyə:57-ci say, 1420-ci il, 121-122-ci səh" alınmışdır).

Habelə orada gəlmişdir "122-ci səh": Sual: Bir insan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bəşər övladı olmadığını və onun qeybi bildiyini, habelə övliyalar, ölülər və dirilərlə təvəssül etməyin Allaha yaxınlaşdıran amil olduğunu etiqad etdiyi halda öləcəyi zaman həmin şəxs cəhənnəmə daxil olan müşrik hesab olunacaqmı? Eyni zamanda qeyd etmək lazımdır ki, həmin şəxs bu etiqaddan başqasını bilmir.Çünki o, elə bir yerdə yaşayır ki, oranın bütün alimləri və camaatı bunu iqrar edirlər.Belə şəxsin hökmü nədir? Habelə beləsinin adından sədəqə verməyin və ona ölümündən sonra yaxşılıq etməyin hökmü nədir?

Şeyximiz (rahiməhullah) demişdir: "Əgər biri Muhammədin (salləllahu aleyhi və səlləm) Adəm oğullarından olmadığını, habelə onun qeybi bildiyini etiqad etdiyi halda ölərsə həmin küfr etiqada görə sahibi böyük küfr edən kafir hesab olunacaq...v.s". Şeyx həmin fətvada cahili istisna etməmişdir.

Şeyxə (rahiməhullah) sual verilmişdir: Cahillik səbəbilə üzürlü olan şəxslər kimlərdir? İnsan fiqhi məsələlərdə yoxsa əqidə və tövhid məsələlərində cahilliyi səbəbilə üzürlü olur? Alimlərin bu məsələlərə nə cür yanaşması gərəkdir?

Şeyx demişdir: "Cəhalət və onda üzürün olması iddiasının təfsilata ehtiyacı vardır.Heç də, hər bir şəxs cəhalət səbəbilə üzürlü deyil.İslamın gətirdiyi və Peyğəmbərin bəyan etdiyi, habelə Allahın kitabının açıqladığı və müsəlmanlar arasında yayılan işlərdə cahillik iddiası məqbul deyil.Ələxsus əqidə və dinin əsası ilə əlaqəli olan məsələlər.Çünki Uca Allah Öz Peyğəmbərini (salləllahu aleyhi və səlləm) insanlara onların dinini açıqlamaq və izah etmək üçün göndərmişdir.O isə öz növbəsində dini lazımınca təbliğ etmiş və ümmətə dinin gerçəyini açıqlayıb onlar üçün hər bir şeyi izah etmişdir.Peyğəmbər ümmətini gecəsi gündüz kimi olan aydın yol üzərə buraxmışdır.Habelə Allahın kitabında hidayət və nur vardır.Bu üzdən əgər bəzi insanlar, şirk və Allahdan qeyrisinə ibadətdə cahillik iddiası yaxud namazın vacib olmadığı iddiası yaxud Ramazan orucunun, zəkatın və imkan olduğu halda həccin vacib olmadığı iddiası kimi müsəlmanlar arasında geniş yayılmış və dindən zəruri olaraq bilinən işlərdə cahil olduqlarını iddia etsələr, bu və bu kimi işlərdə müsəlmanlar arasında yaşayan insandan cahillik iddiası qəbul olunmaz.Çünki bu, müsəlmanlar arasında məlum olan işlərdir.Artıq bu işlərin İslam dinindən olması zəruri olaraq bilinmiş və müsəlmanlar arasında yayılmışdır.Bu səbəbdən, bu işdə cəhalət iddiası məqbul deyil.Həmçinin əgər biri müşriklərin qəbirlərinin ətrafında yaxud bütlərin yanında ölülərə dua etmək, onladan yardım diləmək, qurban kəsmək və nəzr vermək yaxud bütlərə,

ulduzlara, ağaclara və daşlara qurban kəsmək yaxud şəfa diləmək yaxud düşmənlərin əleyhinə ölülərdən, bütlərdən, cinlərdən, mələklərdən və peyğəmbərlərdən kömək istəmək kimi işlərdə cahil olduğunu iddia edərsə (onun sözü qəbul edilməyəcək).Çünki bütün bu işlər dindən zəruri olaraq bilinir və böyük şirkdir.Artıq Uca Allah bunu Öz kitabında açıqlamış, habelə Peyğəmbər (salləllahu aleyhi və sələm) bunu açıqlamışdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) Məkkədə on üç il qalıb insanları bu şirkdən çəkindirmişdir.Habelə Mədinədə on il onlara ibadətin xalis olaraq Allaha aid etməyin vacibliyini açıqlamış və onlara Allahın kitabını oxumuşdur.O, onlara bu kimi ayələri oxumuşdur: *“Rəbbin yalnız Ona ibadət etməyinizi əmr etmişdir.”* Habelə demişdir: *“Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək istəyirik.”* Habelə demişdir: *“Onlar yalnız dini xalis Allaha aid edərək həniflər kimi ibadət etməyə əmr olunmuşlar.”* Habelə demişdir: *“Dini xalis Allaha aid edərək ibadət edin.Doğrusu, əsl din Allaha məxsusdur.”* Habelə demişdir: *“De, mənim namazım da, qurbanım da, həyatım və ölümüm də, aləmlərin Rəbbi olan Allaha məxsusdur.Onun heç bir şəriki yoxdur.Mən bununla əmr olundum və mən ilk müsəlmanlardanam.”* Habelə Uca Allah Peyğəmbərinə mürciət edərək demişdir: *“Həqiqətən Biz sənə kövsəri verdik.Elə isə Rəbbin üçün namaz qıl və qurban kəs!”*.Habelə demişdir: *“Şübhəsiz ki, məscidlər Allahındır.Allahdan başqa heç kəsə dua etməyin!”*.Habelə demişdir: *“Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir məbuda ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir.Şübhəsiz ki, kafirlər nicat tapmazlar!”*.Habelə dinlə istehza etmək, onu yamanlamaq, məsxərəyə qoymaq və söymək kimi bütün bu işlər böyük küfrdür və heç bir şəxs cahillik iddiası ilə bu işlərdə üzürlü

deyil.Çünki dindən zəruri olaraq bilinir ki, dini söymək yaxud Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söymək böyük küfrdür.İstehza və məsxərəyə qoymaq həmçinin.Uca Allah buyurur: *"De: Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz."*

Belə ki, elm əhlinin hər bir yerdə bunu insanlar arasında yayması və adi insanlar üçün üzr qalmasın və onların içində bu iş yayılsın deyə onu aşkar etməsi gərəkdir.İnsanların Misirdə, Şamda yaxud İraqda və ya Mədinədə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbiri yanında yaxud digər yerlərdə ölülərə tapınmağı və onlardan yardım diləməyi tərk etmələri və həccə gələnlərin və insanların bu işə diqqət ayırıb Allahın şəriətini və dinini bilmələri üçün bunu etmək gərəkdir.Alimlərin susması adi insanların həlakı və cəhalətinə səbəbdir.Bu üzdən, məkanından asılı olmayaraq elm əhlinin, insanlar şirki tərk etsin və Allaha bəsirət üzərə ibadət etsinlər deyə Allahın dinini insanlara çatdırması və onlara tövhidi və şirkin növlərini öyrətməsi gərəkdir.Hal-hazırda Bədəvinin yaxud Hüseynin yaxud şeyx Abdul-Qadir əl-Ceyləninin qəbiri yaxud Mədinədə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbiri yanında və ya digər yerlərdə baş verənlərə diqqət ayırmaq və ibadətin xalis Allahın haqqı olduğunu və bu işdə heç kəsin haqqı olmadığını insanlara anlatmaq gərəkdir.Uca Allah buyurur: "*Onlar yalnız dini xalis Allaha aid edərək həniflər kimi ibadət etməyə əmr olunmuşlar."* Habelə demişdir: *"Dini xalis Allaha aid edərək ibadət edin.Doğrusu, əsl din Allaha məxsusdur."* Habelə demişdir: *"Rəbbin yalnız Ona ibadət etməyinizi əmr etmişdir."* Bütün İslam ölkələrində və müsəlman azlıqlarının yerləşdiyi məntəqələrdə və ümumən hər bir yerdə olan elm

əhlinə insanlara tövhidi öyrətməsi və Allaha ibadət məfhumunu anlatması, eyni zamanda ən əzəmətli günah olan şirkdən onları çəkindirməsi gərəkdir.Uca Allah cinlər və insanları yalnız Ona ibadət etmək üçün yaratmış və bunu əmr etmişdir.Uca Allah buyurur: *"Mən cinləri və insanları yalnız Mənə ibadət etmələri üçün yaratdım."* Allaha ibadət etmək: Ona və Peyğəmbərinə (salləllahu aleyhi və səlləm) itaət etmək, ibadəti xalis Ona aid etmək və qəlblərin Ona yönəlməsidir.Uca Allah buyurur: *"Ey insanlar! Sizi və sizdən öncəkiləri yaradan Rəbbinizə ibadət edin ki, bəlkə müttəqilərdən olasınız."*

Lakin insanlar arasında münasibətlər ilə əlaqəli olan bəzi məsələlər, habelə namazın və orucun bəzi məsələləri kimi müəyyən hallarda gizli qalan məsələlərə gəldikdə isə cahil bu işlərdə bəzən üzürlü olur.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) paltarda ehrama girib üzərinə ətir vurmuş şəxsi üzürlü etmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) ona demişdir: Paltarını çıxart və ətirini yuyub apar.Həccində etdiyini yerinə yetirəcəyin ümrədə et! Sonra isə ona cahilliyi səbəbilə fidyə verməyi əmr etməmişdir.Habelə gizli qalan bəzi məsələlərdə cahil insanı öyrətmək və maarifləndirmək lazımdır.Əqidənin əsasları və İslamın ərkanları, habelə aşkar haramlarda isə müsəlmanlar arasında olan heç bir şəxsdən cahillik iddiası qəbul edilməz.Əgər biri müsəlmanlar arasında olduğu halda: Mən zinanın haram olduğunu bilmirdim,-deyərsə onun üzürü qəbul edilməz.Yaxud: Valideyinlərin üzünə ağ olmağın və livatın haram olduğunu bilmirdim,-deyərsə onun üzürü qəbul edilməz, üstəlik həmin şəxsə dair tərbiyəvi tədbirlər görülər.Çünki İslamın bu məsələlərə olan mövqeyi müsəlmanlar arasında bəlli və məlumdur.

Lakin əgər insan İslamdan uzaq məmləkətlərdə yaxud ətrafda müsəlman olmayan Afrika cəngərliklərində olarsa ondan cahillik iddiasının qəbul edilməsi mümkündür.İnsan bu hal üzərə öləcəyi zaman isə onun işi Allaha aid olar və hökmü fətra əhlinin hökmündə olar.Doğru görüşə əsasən həmin şəxs qiyamət günü imtahan olunacaq.Əgər bu cür şəxslər sınaqdan üzü ağ çıxarlarsa cənnətə daxil olarlar.Lakin əgər asi olarlarsa cəhənnəmə daxil olarlar.Müsəlmanlar arasında olub küfr əməllər edən və vacibləri tərk edən şəxs isə üzürlü deyil.Çünki məsələ aydın, müsəlmanlar isə mövcuddurlar. Onlar oruc tutur, həcc edir, habelə zinanın, şərab içməyin və valideyinlərin üzünə ağ olmağın haram olduğunu bilirlər. Bütün bu işlər müsəlmanlar arasında bilinir.Bu işlərdə cahillik iddiası ilə çıxış etmək batil iddiadır.Vallahul mustəan." (məcmu fətəva va məqalət mutə-nəvvia:7/136).

Habelə Səudiyyə Ərəbistanında yerləşən araşdırmalar və fətvalar üzrə daimi komitə cahilliyin üzr olmadığına dair fətva buraxmışdır "9257-saylı, hic:22/12/1405".Fətvada deyilir: "Birinci sual: Küfr yaxud şirk əməllərindən birini edən hər bir şəxs, bunu cahilliyi üzündən etdiyi bilindiyi halda kafir olurmu? Beləsi cahilliyində üzürlü olur yoxsa yox? Habelə üzürün olması yaxud olmamasına nə kimi dəlillər var?

Cavab: Mükəlləf Allahdan qeyrisinə ibadət etmək yaxud Allahdan qeyrisinə qurban kəsmək, nəzr etmək və xüsusi olaraq Allahın haqqı olan digər ibadətlər etməklə üzürlü olmur.Lakin müsəlman ölkələrindən kənarda yaşayan yaxud dəvətdən kənarda qalan şəxs adicə cəhalət deyil dəvətin çatmaması səbəbilə üzürlüdür.Belə ki, Muslim Əbu Hureyradan (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir:

“Nəfsim əlində Olana and olsun ki, elə bir yəhudi və nəsrani yoxdur ki, mənim haqqımda eşidib mənim gətirdiyimə iman etmədikdə ataş əhlindən olmasın.” Peyğəmbər (salləllahu aleyhi və səlləm) eşidəni üzürlü etməmişdir.Heç şübhəsiz ki, müsəlman ölkələrində yaşayan şəxs Peyğəmbər (salləllahu aleyhi və səlləm) haqqında eşitmişdir.Bu səbbədən o, imanın əsaslarında cəhaləti səbəbilə üzürlü deyil...”.Bu fətva şeyximiz Abdul-Əziz bin Abdullah bin Bəzin rəhbərliyi və imzası ilə verilmişdir.

Şeyximiz ibn Bəzin (rahiməhullah) bu məsələyə dair bir sıra açıq-aydın fətvaları vardır.Həmin fətvaların bir qismi onun fətvaları, risalələri və izahlarında yazılı şəkildə təsbit edilmiş, bir qismini isə onun çevrəsində olduğum müddətdə ondan eşidib nəql edirəm.Burada bütün onun sözlərini çərçivəyə salmaq məqamı deyil.Məqsəd sadəcə onun bu məsələyə dair məzhəbini açıqlayan bəzi sözləri vurğulamaq olmuşdur.Bu isə bəzi şəxslərin tövhiddə cahilliyin üzr olması sözünü həmin möhtərəm şeyxə nisbət edib bunu insanlar arasında yaymalarına verilən cavabdır.Heç şübhəsiz ki, şeyx onların dediyi sözdən uzaqdır.

7-Habelə şeyx Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) "ər-raddu alə-r-rafida:18-20-ci səh" kitabında demişdir: "Sən onların fəzilətinə dair ayələrin çoxsaylı, habelə hədislərin cəm halında onların kamilliyinə dair mütavatir olduğunu biləcəyin zaman anlayacaqsan ki, onların yaxud onların çoxunun fasiq olduğunu və onların çoxunun dindən çıxdığını etiqad edən yaxud onları söyməyin doğru və icazəli olduğunu etiqad edən yaxud onları söyməyin doğru yaxud halal olması ilə birgə onları söyən şəxs, Uca Allaha və onların fasiqlikdən, mürtədlikdən, söyüşə layiq olmaqdan uzaq olmasını gərəkdirən fəziləti və kamilliyi barədə xəbər verən Peyğəmbərə (salləllahu aleyhi və səlləm) küfr etmişdir.Bu üzdən, əgər biri Allahdan və Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) sabit olan sözləri təkzib edərsə kafir olar.Qəti mütavatir haqqında cahil olmaq üzr deyil.Habelə fərz olduğunu bilmədiyi üçün beş namazın fərz olduğunu inkar edən şəxs kimi onu mötəbər dəlil olmadan yozmaq və zahirindən döndərmək faydasızdır. Çünki həmin şəxs bu cahilliyi səbəbilə kafirə çevrilir.Habelə əgər insan onu bildiyimiz mənadan digər mənaya yozarsa kafir olar.Çünki Quran və hədislərin nasslarında gələn elm onların fəzilətinə qəti olaraq dəlalət edir.Əgər biri onlardan bir qismini söyərsə və rəşidi xəlifələr kimi həmin səhabələrin fəziləti və kamilliyi bəlli bir məsələ olarsa, onların söyüşə layiq olduğunu yaxud onları söyməyi icazəli olduğunu etiqad edən şəxs Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) qəti sabit olanı təkzib etdiyi səbəbilə kafir olar.Onu təkzib edən kafirdir.Onların söyüşə layiq olduğunu etiqad etmədən yaxud bunu halal saymadan onları söyən şəxs isə fasiqdir.Çünki müsəlmanı söymək fasiqlikdir.Bəzi alimlər

Əbu Bəkri və Öməri (radıyəllahu anhumə) söyənin qeyd-şərtsiz kafir olacağına hökm vermişlər.Doğrusunu bilən Allahdır."

Bir qədər sonra demişdir: "Əlavə olaraq qeyd edim ki, mən Allah qatında müsəlman olanın kafir, Allah qatında kafir olanın isə müsəlman olduğunu etiqad etmirəm.Əksinə mən Onun qatında kafir olanın kafir olduğunu etiqad edirəm.Alimlərdən qiblə əhlinin təkfir olunmayacağına dair sabit olan sözlər, bidəti küfr dərəcəsinə çatmayan şəxslərə aid edilir.Çünki onların (alimlərin) sözləri, bidəti küfr dərəcəsinə çatan şəxsin təkfir ediləcəyinə dair yekdildir. Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) qəti olaraq sabit olanı təkzib etməyin küfr olması şübhəsizdir. Bu kimi işlərdə cahillik üzr deyil. Doğrusunu bilən Allahdır."

Dedim: Şeyxul-İslamın (rahiməhullah) burada qeyd olunan aydın sözlərinə nəzər yetir! O burada səhabələrə dair qəti bilinən məsələlərdə cahilliyin üzr olmadığını qeyd edir. Peyğəmbəri söymək, onun gətirdiyi bəzi işləri inkar etmək kimi bundan daha dəhşətli olan məsələlər necə olsun?! Üstəlik Allahı söymək, Ona zövcə və övlad nisbət etmək, Ona şərik qoşmaq və ibadətin hər hansı bir növünü Ondan qeyrisinə yönəltmək kimi bundan daha dəhşətli olan məsələlər necə olsun?!

Yuxarıda keçən sözlər, Şeyxul-İslamın qəti məsələlər ilə dinin şaxələrini şamil edən zənni məsələlər arasında fərq qoyduğunu və digər məsələlərdən fərqli olaraq qəti məsələlərdə cahilin üzürlü olmadığını tamamilə təsdiq edir.

Artıq elm əhlindən bu sözü təsdiq edən sözlər qeyd edilmişdir.Əlavə fayda üçün şeyxlərimizin şeyxi və Şeyxul-İslam

Muhamməd bin Abdul-Vahhəbin nəvələrindən olmuş imam şeyx Muhamməd bin İbrahim Ali-ş-Şeyxin (rahiməhullah) sözlərini oxucunun nəzərinə çatdırıram.Şeyx "məcmu`əl-fətəva:1/73/74" kitabında demişdir: "Müəyyən şəxsin təkfir edilməsi məsələsi.Bəzi insanlar müəyyən şəxsin heç vaxt təkfir edilməyəcəyini deyir və ibn Teymiyyənin sözlərindən yanlış anladıqları bəzi şeyləri dəlil gətirirlər.Zənnimcə onlar yalnız firon kimi Quranda kafir olmasına dair dəlil gələn şəxsləri təkfir edir və nassların hər bir müəyyən şəxs üçün gəlmədiyi iddiası ilə mürtədin hökmü bölümünü araşdırıb lakin bunun heç bir şəxsə tətbiq olunmadığını düşünürlər!! Bu, kor zəlalət və böyük cəhalətdir.Xeyir! Əslində şərtlərə əsasən bu hökm tətbiq olunur.

Habelə dəlili gizli qalan bəzi şeylərdə müəyyəni təkfir etmək məsələsində dayanan şəxslər.Bu kimi məsələlərdə sübut və dəlalət olaraq hüccət qalxmayana qədər təkfir hökmü çıxarılmır.Beləsinə hüccəti kifayət qədər aydın izah edəcəyin zaman həmin şəxs anlayarsa yaxud: Anlamadım,- deyərsə, yaxud anlayıb inkar edərsə fərq etməz, kafir olacaq. Kafirlərin küfrü heç də bütövlüklə inadkarlıq deyil.

Ancaq Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirməsi zəruri olaraq bilinən işlərə müxalif olan şəxs İslamda yeni olmayacağı təqdirdə, adicə bu müxaliflik səbəbilə kafir olur və istər bu dinin əsasları istərsə də şaxələri olsun açıqlamaya ehtiyac duymur.".

Şeyxin bu sözlərində, ixtilaflı məsələlərdə hüccətin üç yöndən qalxması faydası vardır:

1-Hüccətin çatması "əl-buluğ".Əgər çatarsa:

2-Hüccətin sabit olması "əs-subut".Əgər sabit olarsa:

3-Məsələyə dəlalət etməsi "əd-dilələh".

Bu üçü vasitəsilə gizli məsələdə hüccət qalxır.

Habelə Şeyx (rahiməhullah) "məcmu`əl-fətəva:12/197-198" demişdir: "Mürtəd olduğu halda onu deyən şəxs, habelə yəhudi, ilk hallarında qalmaqda davam edirlər.Buna misal: Bədəvi yaxud Ceylaniyə ibadət edənlər, habelə əhli beytin və digərlərin qəbirlərinə ibadət edən rafizilər və onlardan darda kömək istəyənlər kimi İslamı pozan amil işlətdikləri bəlli olduğu halda "lə iləhə illəllah" deyən şəxslər.Bu, "lə iləhə illəllah" kəlməsini tamamilə pozmaqdır.Beləsinin dili həmin kəlməni deyir lakin onun əməlləri və dili Allahla bərabər digər ilahı isbat edir.

Onun tamamilə bu ləfz və mənada ilah olduğunu etiqad etməsi şərt deyil.İnsan həmin şeyin vasitə olduğunu düşünür.Belə ki, müşriklər həmçinin onu vasitə adlandırmışlar.Çünki onların dilində bu kimi işlərdən ötrü qəsd edilənə, istər onun özü istərsə də onun vasitəçiliyi istənilsin, fərq etməz ilah adlanır.Məhz bu zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara bütün bu şeyləri batil edən ixlas kəlməsi ilə gəlmişdir.Bununla da, özlərini İslama nisbət edənlərin halı bəlli olur.

Sual verən demişdir: Cahil olarsa belə?!

Şeyx demişdir: "Tövhiddə cahillik yoxdur.Burada cahilliyi gərəkdirən heç bir amil yoxdur.Bu şəxs ancaq dindən üz çevirəndir.İnsan günəşdən xəbərsiz olur?! Onların

alimləri cahildirlər.Lakin onlar müşrikdən daha cahil deyillər.Quranda cahillik müraciəti yalnız Allahdan qeyrisinə ibadət edən bəzi şəxslər haqqında qəlmişdir.Onlar cahildirlər.Hüccət isə onların üzərindən qalxmışdır.İki şey yanaşı gəlir: Hüccətin qalxması üçün kifayət edən elm.Üz çevirmək üçün kifayət edən cahillik.”

Həmçinin “məcmu`əl-fətəva” kitabını toplayan şeyx ibn Qasim (rahiməhullah).Belə ki, onunla əl-Əzharın şeyxi arasında elmi münaqişə baş vermiş və həmin şeyx demişdir: Bunlar kafirlərin görünüşünü aşkar etmişlər.Şeyx cavab olaraq demişdir: “Biz də onların önündə təkfir edənlərin görünüşündə çıxacağıq!”.

8-Şeyx (rahiməhullah) "məcmu`əl-fətəva:3/65" növbəti suala cavab verərkən demişdir: "Yaxud insan mənasını bilmədiyi halda küfr sözü dilə gətirmiş və bununla kafir olmamışdır. Bunun mənası, həmin kəlmənin izahını bilmədiyi halda onu dilə gətirmişdir yoxsa onun insanı kafir edəcəyini bilmədiyi halda onu demişdir? Şeyx cavab verib demişdir:

"İnsan küfr sözü dilə gətirib onun açıq-aydın mənasını bilməyəcəyi halda o, mənasını bilmədiyi sözü dilə gətirmiş olacaq.Ancaq həmin sözün onu kafir edəcəyini bilməməsi məsələsinə gəldikdə isə, burada Uca Allahın növbəti ayəsi kifayət edir: *"Üzrxahlıq etməyin! Aiz iman gətirdikdən sonra artıq kafir oldunuz."* Onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) önündə üzrxahlıq edir və həmin sözün onları kafir etməyəcəyini düşünürlər.Lakin həmin məsələni bu hala aid edənlərin hərəkəti təəccüb doğurur.Halbuki onlar növbəti ayələri eşidirlər: *"Onlar Allahı qoyub şeytanları özlərinə dost tutdular və elə güman etdilər ki, doğru yoldadırlar."*[73] *"Şübhəsiz ki, şeytanlar onları haq yoldan sapdıracaq, onlar isə özlərinin doğru yolda olduqlarını güman edəcəklər."*[74]

Məgər bunların kafir olmadıqlarını zənn edir?! Lakin bu məsələlərin qərib olması səbəbilə aşkar cahillik qəribə görünməməlidir."

Dedim: Budur Şeyxul-İslam (rahiməhullah) tövhiddə cahil olan insanları üzürlü hesab edənləri cahil olaraq vəsf edir.Belə ki, mən şeyx Abdullah Əbə Buteynin risalələrinə verdiyim izahda cahilliyi üzr görənləri elmin azlığı və

[73] əl-Əraf:30.
[74] əz-Zuxruf:37.

cahilliklə vəsf etdiyim zaman bəzi şəxslər mənə iradlar tutmuşlar.Şeyx Abdullah həmin şəxsləri cahillik və elmin qıtlığı ilə vəsf etmişdir.Həmin insanlar bir çox elmləri əzbər bilsələr belə araşdırma və tədqiq zamanı onların məhz bu cür olduqları aydın olur.Bəşər övladının yiyələnə biləcəyi bütün elmlərə yiyələnərsə belə tövhidin əhkamlarından cahil olan birisinə Allah bərəkət verməsin!

9-Habelə şeyx (rahiməhullah) "məcmu` əl-muəlləfət" kitabının dördüncü qismində Qurani Kərimin surələrindən çıxan məsələlər bölümündə, 92-ci səhifədə gələn Adəmin əhvalatı və iblisin (lə`nətullahi aleyhi) ona səcdə etməkdən imtina etməsinə dair çıxan faydalarda demişdir: "Faydalardan: Nassları rədd etməklə nəticələnən yaramaz yozum sahibi üçün üzr deyil.Uca Allah iblisi, aşkar etdiyi şübhədə üzürlü etməmişdir.Habelə yanlış yozum gətirərək nasslara müxalif olan şəxs üzürlü olmamışdır.Üstəlik həmin yozum onun küfrünü daha da artırmışdır."

Nəhayət demişdir: "Habelə şübhənin batilliyi açıq-aşkar olacağı zaman onun sahibi üzürlü olmayacaq."

Dedim: Yaramaz yozum, cahilliyin bir şaxəsidir.Buna rəğmən Şeyxul-İslam bunu, yozum sahibini üzrlü edəcək üzr qəbilindən etməmişdir.

**10-Habel**ə “180-cı” səhifədə növbəti ayənin faydalarında demişdir: ***“De: Bu m**ənim yolu**mdur.M**ən və mənə tabe olanlar, **möt**əbər dəlillərə əsasən, insanları Allaha tərəf çağırırıq.”*[75]. On üçüncü: Uca Allahın **axir**ətdən öncə dünyada **pey**ğəmbərlər və onların davamçılarına dair sunnəti (**d**əyişməz **qanunu), habel**ə **onlara müxalif olanlara dair sunn**əti, **cahil kafirl**ər üçün ən aşkar dəlillərdəndir.Bunu anlamayana isə **deyil**əcək: Ağlını necə itirmisən?!”.

**Dedim: Bu,** ən gözəl və **d**əyərli sözlərdəndir.Bu **sözl**ərin **d**əyəri iki yöndən bilinir:

**Birinci**: Şeyx onları cahilliklə vəsf etməsi ilə bir**g**ə **küfrl**ə **v**əsf etmişdir.Bəlli olmuşdur ki, **cahillik v**əsfi onların üzə**rind**ən küfr vəsfini qaldırmamışdır.

İkinci: Bütün peyğəmbərlər, şəriətlərinin müxtəlif olma**s**ına rəğmən **yekdil olaraq tövhid**ə çağırmışlar.**Günümüzd**ə **insanlardan kim bunu v**ə Adəm, İbrahim, Nuh, Musa və İsa **kimi b**əşəriyyət **üçün gönd**ərilən elçilərin olduğunu inkar **etm**ək gücündədir.**M**əgər onlar Hatim ət**-Tainin cöm**ərdliyi, Əhnəf bin Qeysin müdrikliyi, Mədikəribin şücaəti, **B**əxtənsarın qüvvəti, Fironun zalımlığı, Qarunun tüğyanı və **N**əmrudun üsyanı haqqında bilgi əldə etmək gücündə olmuş lakin əzmkar peyğəmbərlərin tövhidinə dair bilgi əldə etmək gücündə olmamışlar? **Müxt**əlif zamanlarda yaşamış insanların vəsfləri və keyfiyyətləri, keçmiş əhvalat **v**ə dastanlar haqqında bilgiyə yol tapdığı **bir arada tövhid**ə **v**ə Allahı**n ibad**ətdə təkləşdir**ilm**əsi haqqında bilgiyə **yol tapmayan q**əlblər**d**ən **v**ə gözlərdən Allaha sığınırıq

---

[75] **Yusuf:108-109.**

**11-Habelə "212-ci" səhifədə növbəti ayədən çıxan faydalar əsnasında demişdir: *"Biz səndən əvvəl də, özlərinə vəhy etdiyimiz məhz kişiləri elçi göndərmişdik.Əgər bilmirsinizsə, zikr əhlindən soruşun."*[76].Dördüncü: Cahilin üzürlü olmadığı onun diqqətinə çatdırılıq.Çünki onun sual vermək imkanı vardır."**

**Dedim: Bu, cahilliyin üzr olmadığına dair açıq-aydın sözlərdir.Çünki cahilin, Uca Allahın dində ona vacib etdiyi işləri bilmək üçün çalışıb səy göstərməsi mümkündür.**

---

**[76] ən-Nəhl:43.**

**12-Habelə "244-cü" səhifədə demişdir: Uca Allah buyurur:** ***"Allaha qarşı yalan uyduran kimsədən daha zalım kim ola bilər?"***[77]**.Faydalardan: Bu kimi işlər Allaha qarşı yalan uydurmaqdır.Habelə insan bilməyəcəyi, üstəlik Allahın razılığını qəsd edəcəyi halda belə bu, zülmün ən böyük növüdür."**

**Dedim: Şeyxin bu sözləri, cahilin niyyəti yaxşı olacağı və həmin şəxs xeyir istəyəcəyi halda belə onun cəhalətində üzürlü olmadığına dair açıq-aydındır.**

---

**[77] əl-Ənam:21.**

13-Habelə *“328-ci”* səhifədə növbəti ayənin təfsirində demişdir: *“Allah bir-biri ilə çəkişən bir neçə şərikli ağası olan kişi ilə tək bir ağası olan kişini məsəl çəkir.Onlar məsəlcə eyni ola bilərmi? Həmd Allaha məxsusdur, lakin onların əksəriyyəti bunu bilmir.”*[78] “Dördüncü: Dəlilin aydın olmasına rəğmən insanların əksəriyyəti cahildirlər.”

Dedim: Uca Allah buyurur: *“Onların çoxu bilməzlər.”* Yəni, müşriklərin çoxu cahildir, bilmirlər.Lakin onların cahilliyi onlar üçün üzr olmamışdır.Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) bunu ayədən çıxan faydalarından biri etmiş və onların cahilliyinin dəlillərin gizli qalması səbəbilə deyil açıq-aydın dəlillər müqabilində olduğunu bəyan etmişdir.

[78] əz-Zumər:29.

**14-Habelə "334-cü" səhifədə növbəti ayənin təfsirində demişdir: *"Lakin Allahdan onlara güman etmədikləri bir əzab düçar olacaqdır."*[79] "Üçüncü: Onlar əməllərinin çirkin olduğunu bilmirlər.Hətta ola bilsin ki, onun yaxşı olduğunu hesab edirlər."**

**Dedim: Bir çox ayədə gələn bu dəlillər, kafirlərin yaxşı işlər gördüklərini güman etdiklərini və sahib olduqları yolun şirk və zəlalət olmasından cahil olduqlarını isbat edir. Lakin müşriklərin bu durumu onların dadına çatmamışdır.**

---

**[79] əz-Zumər:47.**

15-Habelə Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəb (rahiməhullah) "məcmu`əl-muəlləfət:41-ci səh" kitabının beşinci qismində demişdir: "Onlar təkfir məsələsinə dair, habelə mənim dirilişi, cənnəti, cəhənnəmi inkar edən və qadınların miras payına yiyələnməsini inkar edən səhra əhlinin küfrünə fətva verdiyimi yaymışlar.Bununla birgə bu işləri inkar edənlər Allahın kitabının şəhərlərdə mövcud olduğunu və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onların inkar etdikləri din ilə gəldiyini bilirlər.Onların bizim yurdun əksər insanları olmalarına rəğmən onların kafir olduğuna dair fətva verdiyim zaman avam insanlar, ələxsus elm iddiasında olan düşmənlər bunu pisləmişlər.Onlar demişlər: Əgər biri qiyamət gününü və şəriətin bütün buyuruqlarını inkar edəcəyi halda belə "lə iləhə illəllah" deyərsə kafir olmaz!! Nəhayət bəzi bölgələrdə bu baş verdiyi zaman kitabın bir hissəsinə iman gətirib bir hissəsinə küfr edənin küfrünü yəqin bilən, üstəlik icma bağlanmış şaxəli bir məsələni inkar edən şəxsin kafir olduğunu deyən həmin adamlara dedim: Sizə görə icma bağlanmış bir şaxəli məsələni inkar edən şəxs kafir olursa elə isə axirət gününü inkar edən şəxs necə olsun..?!".

Dedim: Bu, qiyamət gününü inkar edən və beləsinin kafir olması haqqında şeyxin dediyi sözlərdir.Şeyx hökmü ümumiləşdirib cəhalətin və elmin azlığı ilə seçilən səhra əhlindən bunu inkar edənləri həmçinin bura daxil etmişdir. Ələxsus onlar Allahın kitabının qəsəbə və şəhərlərdə olduğunu bilirlər.Buna rəğmən onu tələb etmək və onun haqqında bigiyə yiyələnməkdən üz çevirmişlər.Onlar iki cəhətdən kafir olmuşlar.Cahil olub qiyamət gününü inkar

etmələri və Allahın dinindən üz çevirmələri, onu öyrənməmələri və ona əməl etməmələri cəhətindən.

Əgər biri deyərsə ki, bununla sən İslama mənsub olub İslamın həqiqətlərindən heç bir şeyi bilmədiyi halda dünyanın müxtəlif yerlərində yaşayan bir çox insanları təkfir etmiş olursan!

Cavab olaraq deyiləcək: Buna dair mənim əvəzimə imam Muhamməd bin İsmail əs-San`ani cavab verəcək.Belə ki, imam "təthirul itiqad:137-ci səh, dımnə məcmu` aqidətul muvahhidin" kitabında bu haqda soruşulduğu zaman demişdir: "Əgər sən insaflı olmağı istəsən və öncə deyilən bəzi sözlərə tabeçiliyi tərk etsən biləcəksən ki, haqq, nəsilbənəsil avamların yekdil olduğu deyil yalnız dəlilə dayanan bir şeydir.Bil ki, bizim inkar etdiyimiz və kökündən dağıtmağa səy göstərdiyimiz amil, İslamı, dəlilsiz ata-babalara təqlid üzərində quran və səfil ilə yüksək arasında fərq qoymadan onlara tabe olan avam insanlardan sadir olandır.Onlardan biri belə insanların yaşadığı qəsəbə və ölkədə böyüyüb başa çatır.Oranın camaatı isə ona uşaqlıqdan bəri etiqad etdikləri şəxslərin adı ilə nida etməyi ona öyrədirlər.Bu adam insanların həmin şəxsə nəzr etdiklərini, onu təzim etdiklərini, onu həmin şəxsin qəbiri üstünə apardıqlarını, onun torpağını öz üzərlərinə sürtdüklərini və qəbirini təvaf etdiklərini görür.Bu adam bu mühitdə yaşayır və nəticədə insanların təzim etdikləri şəxsin əzəməti onun qəlbində qərar tutur. Onun üçün ən əzəmətli şey onların etiqad etdikləri olur. Məhz bu hal üzərə uşaq böyüyüb başa çatır, yetkin insanlar isə yaşa dolur.Onlar kiminsə bunu pislədiyini eşitmir.Üstəlik sən elm və fəzilət sahibi olaraq

qələmə verilən və qazilik, fətva, tədris yaxud rəhbərlik, bilik yaxud əmirlik və hakimlik üçün irəli sürülən insanların təzim olunduğunu, sayğı göstərildiyini, nəzirlər aldığını və qəbirlərin başında kəsilən qurbanları yediyini görə bilərsən...v.s”.

İmam əs-San`ani bundan öncə “131-ci” səhifədə bu şəxslərin cahillik səbəbilə üzürlü olmadıqlarını vurğulayıb demişdir: “Əgər desən: Onlar cahildirlər. Məgər onlar etdikləri əməllər ilə müşrik olurlar?!

Deyəcəm: Artıq fəqihlər fiqh kitablarının mürtədlik bölümündə qeyd etmişlər ki, əgər biri küfr sözü dilə gətirərsə, onun mənasını qəsd etməyəcəyi halda belə kafir olacaq. Bu isə onların İslamın gerçəyini və tövhidin mahiyyətini bilmədiklərini göstərir. Məhz bu səbəbdən onlar əsli kafirə çevrilmişlər. Uca Allah qullarına, Onu ibadətdə təkləşdirməyi fərz etmişdir. *"Allahdan başqasına ibadət etməyin."*[80] Habelə Ona ixlaslı olmağı fərz etmişdir. *“Onlar yalnız dini xalis Ona aid edərək Allaha ibadət etməyə əmr olunmuşlar.”*[81] Əgər biri gecə və gündüz, gizli və aşkar, habelə qorxaraq və diləyərək Allaha səslənər daha sonra başqasına dua edərsə Allaha ibadətdə şərik qoşmuş olar. Çünki dua, ibadətdəndir. Artıq Uca Allah onu ibadət adlandırmışdır. Uca Allah buyurur: *“Rəbbiniz dedi: Mənə dua edin, Mən də sizə cavab verim. Həqiqətən, Mənə ibadət etməyə təkəbbür göstərənlər cəhənnəmə zəlil olaraq girəcəklər.”*[82] Sözləri burada bitir.

---

[80] Hud:26.

[81] əl-Bəyyinə:5.

[82] Ğafir:60.

Dedim: Bu, imam San`anidən gələn çox önəmli sözlərdir. Belə ki, imam, Allahdan qeyrisinə nəzr etmək, qurban kəsmək, dua etmək kimi şirk əməllər üzərə qaldığı halda yaxud diriliş günü və axirət günü kimi dindən zəruri olaraq bilinən bir şeyi inkar etdiyi halda özünü İslama nisbət edənlərin bununla mürtəd deyil əsli kafir olacaqlarını qeyd etmişdir. Çünki həmin şəxs ilk öncə Allahdan başqa ibadət olunan bütün şeylərə küfr etməmişdir.Onun halı şirk üzərə qalmaları ilə birgə şəhadəti dilə gətirən münafiqlərin halı mislindədir.Mürtəd isə həqiqi müsəlman olmuş daha sonra onun İslamını pozan amil işlətmiş şəxsdir.Bunların isə ümumiyyətlə doğru İslamı olmamışdır.Çünki həmin adamlar "lə iləhə illəllah" şəhadətinin ikinci dayağını gerçəkləşdirməmişlər.Yəni, onlar Uca Allahdan savayı ibadət olunan bütün məbudlara küfr etməmişlər.Çünki Allahdan başqa bütün məbudlara küfr etmədən sadəcə Allahın rübubiyyətini etiraf etmək, üstəlik Allahın ibadət olunmağa layiq olduğunu etiraf etmək İslama daxil olmaq üçün kifayət etmir.Bu, həmin kəlmənin ən önəmli dayağıdır.Çünki peyğəmbərlərlə onların xalqları arasında baş vermiş ixtilaf və çəkişmə məhz bu işdə olmuşdur.Onlar demişlər: *"O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir."*[83] Bu səbəbdən, tövhid kəlməsində inkar, isbatın önünə çəkilmişdir."Lə iləhə: ilah yoxdur": Allahdan başqa ibadət olunan bütün məbudlar inkar edilir."İlləllah: Allahdan başqa": İbadət yalnız Allaha isbat edilir.İnsan öncə qəlbini Allahdan başqa olan bütün məbudlardan təmizləməli daha sonra Uca Allahı ibadətdə təkləşdirməlidir. Qurani Kərimdə

---

[83] Sad:5.

buna dair çoxlu ayələr vardır.Həmin ayələrdə tağuta küfr etmək Allaha iman etməkdən önə çəkilir. Çünki Allaha iman yalnız bununla tamamlanır.Əks halda müşriklər birinci deyil ikinci dayaqda bizə müvafiq olacaqlar.Uca Allah müşriklər haqqında buyurur: *“Onlar gəmiyə mindikləri zaman, dini yalnız Allaha məxsus edərək, Ona yalvarırlar.Allah onları xilas edib quruya çıxaran kimi, yenə də Ona şərik qoşurlar.”*[84] Habelə Uca Allah buyurur: *“Onların çoxu ancaq şərik qoşaraq Allaha iman gətirir.”*[85] **İlk öncə tağuta küfr etməyin gərəkli olduğuna dəlillərdən biri, Uca Allahın İbrahim və onun tayfası haqqında xəbər verdiyidir. İbrahim onlara demişdir:** *“Mən sizin ibadət etdiklərinizdən uzağam.Yalnız məni yaradandan başqa! Şübhəsiz ki, O məni doğru yola yönəldəcək.”*[86] Habelə Uca Allah buyurur: *“Dində məcburiyyət yoxdur.Artıq doğru yol azğınlıqdan aydın fərqlənir.Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar.Allah Eşidəndir, Biləndir.”*[87] Doğrusunu Allah bilir.

---

[84] əl-Ənkəbut:65.

[85] Yusuf:106.

[86] əz-Zuxruf:26-27.

[87] əl-Bəqərə:256.

16-Habelə Şeyxul-İslam Muhammәd bin Abdul-Vahhәb (rahiməhullah) öncәki mənbәdә "75-ci sәh" onun vaxtında yaşamış bәzi insanları tövhiddә cahillikdən çәkindirәrәk demişdir: "Əgər Uca Allah sənin qəlbinə haqqı bilməyi və ona boyun əyməyi, habelə tağuta küfr etməyi və bu əsaslara müxalif olanlardan, onlar atan yaxud qardaşın olarsa belə uzaq durmağı daxil edərsə bunu mənə yaz və məni sevindir. Çünki bu, şaxəli (fər`i) məsələlərdə olan xəta mislində deyil.Üstəlik inkar etmək qalsın bir yana buna dair cahillik zina və oğurluq mislində deyil.Vallahi, sonra vallahi, sonra vallahi məsələ daha böyükdür.Əgər sənin qəlbində anlaşılmazlıq yaranarsa qəlbləri çevirən Allaha yalvar ki, səni Öz dininə və Peyğəmbərinin (salləllahu aleyhi və səlləm) dininə müvəffəq etsin."

Dedim: Bu sözün sağlam ağıl sahibi birisinə gizli qalacağını düşünmürəm.Şeyxul-İslam burada yasaq edilmiş şaxəli məsələlərdə, hətta zina və oğurluq kimi dindən zəruri olaraq bilinən bəzi haramlarda xəta ilə cahillik arasında fərq qoyur.

17-Habelə Şeyxul-İslam (rahiməhullah) öncəki mənbədə "183-cü səh" demişdir: "Əgər deyilərsə ki, bütün insanlar onu, yəni "lə iləhə illəllah" kəlməsini deyirlər, cavab olaraq deyiləcək: Onlardan bəzisi həmin kəlməni deyir və düşünür ki, onun mənası Allahdan başqa yaradan və ruzi verən yoxdur və bu kimi şeylər.Onlardan bir qismi isə ümumiyyətlə onun mənasını anlamır.Onlardan bir qismi isə onun tələbinə uyğun əməl edir.Onlardan digər bir qismi isə onun gerçəyini dərk etmir.Bundan daha təəccüblü isə onu bir cəhətdən bilib digər cəhətdən ona düşmən kəsiləndir. Ondan daha təəccüblü isə həmin kəlməni sevən, özünü onun əhlinə aid edən lakin onun dostları ilə düşmənləri arasında fərq qoymayandır.Subhanəllahil azım! Onların iki fərqli tayfa olub bir dində və hamının haqq üzərə olması necə ola bilər?! Xeyir, bu əsla ola bilməz!".

Dedim: Şeyx bu vəsfləri gətirməklə zamanında yaşamış və şeyxin təkfir etdiyi müşrikləri qəsd edir.Onlar şeyxə etiraz edib özlərinin "lə iləhə illəllah" kəlməsini dilə gətirdiklərini demişlər.Şeyx isə onların sözlərini bir çox yerlərdə, xüsusi olaraq ən dəyərli kitablarından biri olan "kəşfu-ş-şubuhat" kitabında rədd etmiş və xəbər vermişdir ki, məqsəd həmin kəlmənin adicə dil ilə tələffüzü deyil.Çünki əgər belə olsaydı, İslamı aşkar edib küfrü daxildə gizlədən münafiqlər bu kəlmədən fayda görərdilər.Habelə səhabələr mürtədlərə, həmçinin Bənu Hənifə qəbiləsinə qarşı savaşmaz, Əli onu ilah edənləri öldürməz, namazı tərk edənin, zəkatı verməkdən imtina edənin və atasının zövcəsi ilə evlənənin qanını halal saymazdılar."Lə iləhə illəllah" kəlməsini pozanın, onu gecə və gündüz min dəfə dilə gətirərsə

belə küfrünün sabit olacağına dair dəlillər həddindən artıq çoxdur. Mən isə öz növbəmdə dininin qeyrətini çəkən hər bir muvahhidin Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin müəllifi olduğu "kəşfu-ş-şubuhat" kitabını oxumağı tövsiyə edirəm.Təbii ki, əgər müsəlman həmin xəzinəni daimə özü ilə daşıyıb müxaliflərə rəddiyə vermək üçün onu əzbərləyər və onu mənimsəyərsə daha gözəl olar.Habelə şeyxin digər yazdığı kitablar.Artıq bu şübhə insanların beynində dərin kök salmış və nəticədə onlar "lə iləhə illəllah" deyən insanın mütləq şəkildə kafir olmayacağını zənn etmişlər.Bununla onlar, Quranın açıq-aydın nasslarına müxalif olmuşlar.Uca Allah buyurur: *"Sizlərdən hər kim öz dinindən dönsə".*[88] Habelə buyurur: *"Siz iman gətirdikdən sonra artıq kafir oldunuz".*[89] Habelə açıq-aydın sunnəyə müxalif olacaq. Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: Müsəlmanın qanı yalnız üçündən biri ilə halal olur...". Onların içində dinini buraxıb çamaatdan ayrılanı qeyd etmişdir.Habelə Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Kişi ilə küfr yaxud şirk arasında namazın tərki durur." Habelə Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Mən, insanlar Allahdan başqa haqq ilahın olmadığına və mənim Onun elçisi olduğuna şahidlik etməyincə onlara qarşı savaşmaqla əmr olundur.Əgər onlar bunu edərlərsə onun haqqı istisna olmaqla məndən qanlarını və mallarını qorumuş olarlar." Habelə xəvariclər və onların çoxlu ibadət etmələrinə rəğmən dindən çıxmaları haqqında hədislər.Habelə bunu deyən şəxs alimlərin icmasına müxalif olacaq.Belə ki, alimlər yazdıqları fiqh

[88] əl-Maidə:54.
[89] ət-Təubə:66.

kitablarında “mürtədin hökmü bölümü” adı altında bir fəsil açıb deyirlər: “Bu, İslama girdikdən sonra kafir olan şəxsdir.” Daha sonra onun küfrünə misallar çəkirlər: Allaha vasitələr tutmaq yaxud dindən zəruri olaraq bilinəni inkar etmək. Buradan məlum olur ki, əgər biri Quran və sunnənin açıq-aydın dəlillərinə və ümmətin icmasına müxalif olarsa o, qanı halal olan kafir olar.Həmin şəxs tövbəyə dəvət edilər.Əgər tövbə etməzsə qətlə yetirilər.

18-Habelə şeyx (rahiməhullah) öncəki mənbədə “209-210-cu səh” Mutavvi adlı şəxsə yazdığı məktubda demişdir: “Əslində şeyxin dönəmində, yəni ibn Teymiyyənin dönəmində elm və təlif iddiasında olan şəxslərdən bəzisi tövhidi inkar etmiş, onu peyğəmbərləri və övliyaları təhqir etmiş və bu yolda olanları təkfir etmişlər.Elə isə, Kuvvaz gübbəsi və bu kimi şeylərə ibadət edənlərin bunu inkar etmədiyini necə iddia edirsən? Üstəlik sən onların bunu qəbul etdiklərini, bunu etiqad etdiklərini və şirkdən uzaq durduqlarını və yalnız təkfir olunmayacaq şəxslərin təkfir edilməsini inkar etdiklərini iddia edirsən!! Bundan daha böyük və dəhşətli olan isə sizin səhra əhlinin bütövlüklə kitaba küfr edib dindən tamamilə uzaqlaşmalarını və qiyamət gününə inanan şəhər əhlinə istehza etmələrini bilməyinizdir!! Onlar Muhammədin Allahın Elçisi və Allahın kitabının şəhər əhlində olduğunu iqrar etmələrinə rəğmən tağutun hökmünü Allahın şəriətində gələn hökmdən üstün tutmuş və onu (şəriət hökmünü) ələ salmışlar.Lakin onlar inadkarlıq səbəbilə təkzib etmiş, kafir olmuş və istehza etmişlər.Buna rəğmən siz onların küfrünə dair bizə irad tutur və “lə iləhə illəllah” deyən şəxsin kafir olmayacağını açıq söyləyirsiniz.” Nəhayət demişdir: “Əgər fərz edilərsə ki, digər insanlar cahillik səbəbilə üzürlü olacaq, (yenə də bu sizə şamil olunmayacaq).Çünki siz elmli olduğunuzu bildirirsiniz.”

Dedim: Şeyxin sözlərinə diqqət yetir.Onun Allaha şərik qoşan, tövhidi pisləyən və qiyamət gününü inkar edən səhra əhlini mütləq şəkildə necə təkfir etdiyinə nəzər sal! Habelə

Kuvvaz qubbəsinə ibadət edənləri pislədiyini və onların tövhidi bəyənmədiklərini, ondan insanları çəkindirdiklərini və bunu peyğəmbərləri və övliyaları kiçiltmək kimi qəbul etdiklərini xəbər verdiyinə nəzər yetir! Daha sonra şeyxin növbəti sözlərinə diqqət yetir: "Əgər fərz edilərsə ki, digər insanlar cahillik səbəbilə üzürlü olacaq...".Şeyx burada cəhalətin üzr məsələsini əminlik və iqrar etmək növündən deyil fərziyyə şəklində və müxalifə güzəşt olaraq qeyd etmişdir.Şübhəsiz ki, ilzam məqsədilə müxalifə müraciətdə güzəştə getmək elmi münaqişədə doğru məsləkdir.Cahillik və nəfsi istəkləri buraxıb bu sözlər barədə düşünən hər bir şəxs bu sözlərin aydın olduğunu görər və Uca Allah onu həmin məsələdə doğru olan görüşə müvəffəq edər.Lakin Uca Allahın dediyi kimi: *"Çünki əslində gözlər deyil, kökslərdəki qəlb kor olur."*[90]

[90] əl-Həcc:46.

19-Habelə şeyxin öncəki mənbədə “226-237ci səh” Süleyman bin Suheymə yolladığı çox mətanətli məktubunda şirki və cahilliyi pisləyən ifadələri vardır.Orada şeyx onun üzərindən təkfirin qaldırılması üçün onun cahilliyini üzürlü etməmişdir.Həmin məktubda demişdir: “Lakin sən cahil və müşrik birisi və Allahın dininə kin bəsləyən insansan.Sən İslam dinindən xoşlanmayan ancaq şirk dinini və atalarının dinini sevən cahilləri aldadırsan.Əslində isə əgər bu cahillərin istəyi haqqa tabeçilik olsaydı sənin sözünün nə qədər yaramaz olduğunu bilərdilər.”

Dedim: Şeyx burada həmin adamı təkfir edir və eyni zamanda onun cahil birisi olduğunu açıq bildirir.Habelə şeyx həmin şəxsin və onun kimi adamların sözlərinə aldanan cahilləri təkfir etmişdir.

20-Habelə şeyx qeyd edilən mənbədə "254-cü səh" Quran və sunnəyə tabeçiliyi tərk edənlərə və fəqihlərin sözlərinin arxasınca kor-koranə düşənlərə inkar məzmunlu sual ünvanlayıb demişdir: "Bir sözlə məsələnin məğzi belədir: Görəsən hər bir müsəlmana Allahın Peyğəmbərə (salləllahu aleyhi və səlləm) nazil etdiyi elmi tələb etmək vacibdir və heç bir şəxs onu tərk etməkdə üzürlü deyil? Yoxsa ona "ət-tuhfə" kimi kitablara tabe olmaq vacibdir...?".

Dedim: Şeyxul-İslam burada insana vacib olanın, Allahın Peyğəmbərə (salləllahu aleyhi və səlləm) nazil etdiyinə tabe olmasını və heç kəsin onu tərk etməkdə üzürlü olmamasını bəyan etmək üçün inkar məzmunlu sual qoyur.Habelə şeyx "ət-tuhfə" dediyi zaman ibn Həcər əl-Heytəminin müəllifi olduğu "tuhfətul muhtəc lişərhil minhəc" kitabını qəsd edir.

21-Habelə "əd-durar əs-səniyyə:2/60" kitabında şeyx (rahiməhullah) tövhidə təşviq etdikdən sonra demişdir: "Bundan üz çevirən, nəticədə qəlbi Allah tərəfindən möhürlənən və dünyanı dindən üstün tutan şəxsi Uca Allah cahilliyi səbəbilə üzürlü etməmişdir.Doğrusunu bilən Allahdır."

Dedim: Bu, imamın aydın məzhəbidir.Şeyx tövhid məsələsində heç kimsəni cəhalət səbəbilə üzürlü etmir.

**22-Habelə** şeyx "əd-durar:22/53" kitabında demişdir: **"Uca Allah buyurur**: *"Biz hər ümmətə: Allaha ibadət edin, tağutdan uzaq durun,-deyə elçi göndərdir."*[91] Məqsəd həmin kəlmənin mənasıdır.İnsanın onun mənası barədə cahil olduğu halda onu tələffüz etməsi ona fayda verməyəcək. Çünki münafiqlər kafirlərdən daha aşağı, cəhənnəmin ən alt təbəqəsində olduqları halda onu deyirdilər."

**Dedim**: Bu, "lə iləhə illəllah" sözünün mənasına dair cahilliyin heç bir fayda verməyəcəyinə və insandan etdiyi şirk rüsvayçılığını dəf etməyəcəyinə dair imamın açıq-aydın sözləridir.Çüni cahilliyi səbəbilə şirk edən şəxs "lə iləhə illəllah" kəlməsinin birinci şərtini yerinə yetirmir.Bu şərt, onun mənasını bilməkdir.Şərtin yoxluğu isə məşrutun yoxluğunu gərəkdirir.Belə olacağı təqdirdə insan, onu deyərsə belə həmin kəlmənin əhlindən olmayacaq.

[91] ən-Nəhl:36.

**23-Habelə şeyx (rahiməhullah) "əd-durar:2/26" kitabında növbəti ayəni şərh edərkən demişdir:** ***"İbrahimə, Musaya və İsaya tövsiyə etdiyimizi sizin üçün də dində qanun etdi: Dinə doğru-düzgün etiqad edin və onda bölünüb firqə-firqə olmayın".*[92]** **Bil ki, Allahın qullarına tövsiyə etdiyi, küfr ilə islamı ayıran tövhid kəlməsidir.Məhz bu zaman insanlar cahillikləri yaxud həddi aşdıqları yaxud inadkarlıqları səbəbilə bölünmüşlər.".**

**Dedim: Burada insanların tövhid kəlməsindən uzaq duşmə amilləri vurğulanır.Həmin uzaq düşmə səbəblərindən cahillik, həddi aşma və inadkarlıqdır.Elə isə necə deyilə bilər ki, şeyx cahilliyin "lə iləhə illəllah" kəlməsindən uzaq düşməyi gərəkdirmədiyini hesab etsin və şirkə düşəni bu üzdən üzürlü etsin?!**

---

**[92] əş-Şura:13.**

24-Habelə şeyx (rahiməhullah) “əd-durar:8/118” kitabında demişdir: “Onun Müseylimə və başqalarının ardıcıllarından olan mürtədlərə dair dediyi sözlər.Artıq alimlər icma etmişlər ki, onlar, bundan cahil olsalar belə mürtəddirlər.”

Dedim: Bu sözlər, Müseylimənin ardıcıllarına mürtəd-lik hökmünün çıxarılmasına dair açıq-aydındır.Şeyx onları hər hansı bir üzr səbəbilə, hətta onlar cahil olsalar belə üzürlü etməmişdir.Bu isə onu göstərir ki, əgər biri Peyğəm-bərdən (salləllahu aleyhi və sələm) sonra hər hansı bir şəxsin pey-ğəmbər olduğunu iddia edərsə şeyxə görə beləsi cahilliyində üzürlü olmayacaq.Elə isə Allaha şərik edib ona dua edən, ona qurban kəsən və ona nəzr edən şəxs necə olsun?!

Şeyxul-İslam imam Muhamməd bin Abdul-Vahhəbin sözlərindən olan bu açıq-aydın məqamlar sənə, -ey haqqı istəyən!-, imamın Allaha şərik qoşmaqda və Onun əmrinə müxalif olmaqda cahilliyin üzr olmayacağını hesab etdiyini göstərir.

Bütün bunlardan sonra Şeyxul-İslamın ən məşhur kitab-larında dediyi sözlərindən olan bu məqamları görməyən şəxslər Allahdan qorxmurlar?! Onlar saleh sələfin yolu olan şeyxin yoluna tabe olduqlarını iddia edirlər.Əslində isə həmin adamlar, onların nəfsi istəklərini təmin edən və gö-rüşlərinə dəstək verən bəzi sözləri necədə yaxşı görür şeyxin ən məşhur kitablarında dediyi açıq-aydın sözlər isə tərk edilir.

Peyğəmbər (salləllahu aleyhi və sələm) bizə hər bidət sahibi-nin vəsfini xəbər verərək demişdir: “O, nəfsi istəyinə uyğun gələn istisna yaxşını bilmir, münkəri isə inkar etmir.”

**Onlar şeyxin sözlərini anlamamış və yalnız onların nəfsi istəklərinə uyğun gələn sözləri qəbul etmişlər.**

**Ey Allahın qulu! Allahdan qorx və kafirləri cahillikləri səbəbilə üzürlü etməkdən çəkin! Qorx ki, zalımlara yardımçılardan olarsan.**

## Fəsil

## Şeyxul-İslam ibn Teymiyyənin (rahiməhullah) sözlərində olan qaranlıq məqamlara dair gətirilən şübhələrin ifşası

İki imamdan nəql etdiyim sözlərin ardından çox önəmli bir fəsilə keçirəm.Müxaliflərin etdiyi kimi mənim də onu diqqətsiz qoymağım doğru olmazdı.Bu isə, iki şeyxin bütün sözlərini nəql etmək və məqsədəuyğun gələnlə kifayətlənib dəlilsiz və sübutsuz digər sözləri diqqətsiz buraxmamaqdır. Artıq mən qeyd etmişəm ki, bu iki imamın müəyyən ifadələri vardır ki, ondan cahilliyin üzr olması anlaşıla bilər.Habelə qeyd etmişəm ki, bu və bu kimi sözlərə dair məsləklər üç növdən ibarətdir.Bunlar:

<u>Birinci məslək</u>: Bu sözlərdə dayanmaq və həmin imamları ziddiyətə və bir söz üzərə sabit qalmamağa nisbət etmək.

Əslində isə Şeyxul-İslam ibn Teymiyyə və Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhuməllah) böyük məqam sahibləri olduqlarına görə bu kimi vəsflərdən uzaqdırlar. Çünki etiqadı məsələlərdən olan bu məsələ ən ciddi və incə məsələlərdəndir.Müjdə və təhdid, habelə təkfir və onunla əlaqəli olan məsələlər.Çünki əgər bu iki imam bu məsələdə ziddiyətdə olsaydılar, onların digər məsələlərdə ziddiyətdə olması ilk növbədə olardı.Lakin bu əsassız və uydurma sözdür.Biz onların məsum olmadıqlarını etiqad etsək belə onlardan bunun sadir olması mümkün deyil.Lakin bəzən

ixtilafın daxil olduğu bəzi dini məsələlərdə onların xəta etməsi istisna deyil.

İkinci məslək: Bir sözü götürüb digərini heç bir sübut və dəlil olmadan və sadəcə adi nəfsi istək və meyl səbəbilə rədd etmək.

Bu, nəfsi istəklərə uymaq, üstəlik Allahın qullarına iftira yaxıb onların demədiyi sözləri onların ayağına yazmaqdır. Uca Allah buyurur: *“Hər kəs bir xəta və ya günah edib onu günahsız bir adamın boynuna atarsa, şübhəsiz ki, öz boynuna böhtan və açıq-aşkar günah götürmüş olar.”*[93] Habelə Uca Allah buyurur: *“Mömin kişi və qadınları etmədikləri bir işdən ötrü incidənlər, şübhəsiz ki, öz üzərlərinə böhtan və açıq-aydın bir günah götürmüşlər!”.*[94]

Heç şübhəsiz ki, bu, Uca Allahın qullarına haram etdiyi zülm növündən bir işdir.Üstəlik bu zülm, zülmün hər üç növünü özündə cəm edir.Bu, hökmün Allaha və Onun Elçisinə nisbət olunması ilə edilən zülm.Bu növ, Allaha və Peyğəmbərə qarşı elmsiz söz deməkdir.Habelə insanlara qarşı edilən zülm və həmin sözün onlara nisbət edilməsidir.Habelə insanın Allahın nazil etdiyinə dair elmsiz danışmaqla daşıya bilməyəcəyi yükün altına girməklə özünə zülm etməsidir.Uca Allah buyurur: *“Bilmədiyin bir şeyin ardınca getmə.Günki qulaq, göz və ürək, bunların hamısı sorğu-sual olunacaqdır.”*[95]

---

93 ən-Nisə:112.

94 əl-Əhzab:58.

95 əl-İsra:36.

İnsanların bu kimi sözlər nəticəsində hansı fitnə və bəlalara düşmələri heç də gizli məsələ deyil.Batilə rəvac vermək üçün onu haqq əhlinə nisbət etmək müqəddimədə qeyd edildiyi kimi yəhudi, nəsrani, müşriklər və nəfsi istəklərinə uyanların tutduğu yoldur.Bu iki imamın şöhrəti və Allahın insanların qəlbində onlara qarşı rəğbət oyatması və onların sunnə imamlarından olması səbəbilə bəzi insanların öz batillərini həmin imamlara nisbət etmələri heç də təəccüblü deyil.Əgər onlar bu sözləri başqalarına nisbət etsəydilər, güman ki, insanlar bunu qəbul etməz və bundan razı qalmazdılar.Bu səbəbdən, bəzi alimlər tövhidin təməlində cahillik səbəbilə üzürün olduğunu bildirir və sanki Əbu Hənifə, Şafii, Tabəri, Mərvəzi, ibn Mandəh, Xatıb əl-Bağdədi, ibn Batta və digər insanların elm əhli və dində imam deyilmiş kimi onların sözlərini qulaq ardına vururlar. Əslində isə bunlar təhqiqçi imamlar və fəzilətli əsrlərə ən yaxın olan insanlardır.Onlar hədis və isnad əhlindən olan imamlara yetişmişlər.Elə isə, nədən onların əqidələri və sözlərindən üz çevirir və Şeyxul-İslam ibn Teymiyyə və ibn Abdul-Vahhəbin mütəşabih sözlərinə üz tuturlar? Kaş ki, bu adamlar insaflı olub onların bütün sözlərini nəql edəydilər.

Üçüncü məslək: Haqq və insaf əhlinin məsləki.

Alimin dediyi bütün sözlərə nəzər salmaq.Ardından:

(1)-Onun sözlərindən doğru olanı seçmək və xəta etdiyi məsələdə ona üzr axtarmaq.

(2)-Yaxud onun sözlərini cəm etməyə çalışmaq.Bəzən alimin müəyyən bir məsələdə dediyi sözlər çoxsaylı formalarda olub fərqlənir.İnsan isə düşünür ki, onun buna dair bir

neçə rəvayəti vardır.Bu isə çox vaxtı öz imamlarının sözlərini təhlil etdikləri zaman məzhəb ardıcıllarının düşdükləri yanlış fikirdir.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) fətvalarının bir çox yerində bununla bağlı bir məsələyə dair dedikləri sözdə imamların yekdilliyini, onlara nisbət olunan ixtilafa tabe olmağın isə yanlış olduğunu vurğulayır.

(3)-Habelə onun məhz sonuncu sözlərində doğru olana müvəffəq olduğu, xəta etdiyi görüşün isə ona dəlil bəlli olmamışdan öncə ilk sözlərində olduğunu hesab etməkdir. Çüni bəzən dəlil alimə gizli qalır və o, ona müxalif fətva verir.Ardından ona müvafiq digər fətva verir və biz dəlilə uyğun gələn sözü alır ona müxalif olan sözü isə dəlilin çatmaması yaxud çatıb səhih olmaması yaxud çatması və səhih olması lakin ona dəlalət etməməsi səbəbilə alimə üzr gətirir və onun sözünü tərk edirik.Habelə Şeyxul-İslamın "raf`ul mələm anil əimmətil ə`ləm" kitabında qeyd etdiyi digər üzürlər.[96]

---

[96] Habelə burada önəmli bir mülahizə var.Bu isə, imamlardan nəql olunana müxalif olan sözlərə dair öncə qeyd edilməyən digər bir gerçəkdir.Bu gerçək: Onlardan nəql olunan bəzi sözlərin ümumiyyətlə onlardan səhih və sabit olmamasıdır.Bu, Şeyxul-İslam ibn Teymiyyədən nəql olunan bəzi ifadələrdə mövcuddur.Artıq şeyx Süleyman bin Səhman "əl-əsinnətul hidəd fi-r-raddi alə aləviyyil haddəd" kitabında bu sözlərin bəzi növlərini qeyd etmişdir.Habelə Şeyxul-İslama cəhənnəmin fani olmasına dair risalənin nisbət olunması.İnsanlar bu risalənin ona nsbət olunmasının səhihliyinə dair ixtilaf etmişlər.Üslətik "məcmu` əl-fətəva"da Şeyxul-İslamın görüşlərindən uzaq görüşlər, bəzən isə onun məşhur məzhəbinin əsasına zidd gələn məqamlar mövcuddur.İrəlidə Şeyxul-İslamın sözlərindən olmayan bu kimi məqamlar bəyan ediləcək.

Alimlər barədə gözəl zənndə olmaq üçün onların bir-birinə müxalif olan sözlərini cəm etmək daha məqsədəuyğundur.Əgər bunu etmək mümkün olmazsa həmin sözlərdən dəlilə müvafiq gələni götürəcək, xətalı sözlərə üzürlər axtarmaqda özümüzü çətinə salmayacağıq. Çünki təbliğdə məsumluq yalnız Peyğəmbərə (salləllahu aleyhi və səlləm) və ondan öncəki peyğəmbərlərə məxsusdur.

Buna əsasən, Şeyxul-İslam ibn Teymiyyə və Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbdən nəql olunan və cahilliyin üzr olduğu anlamını daşıyan bütün sözlər aşağıdaki mənalardan kənar deyil:

(1)-Dində olan gizli məsələlərdən bir məsələ.Dinin əsasları isə fərqlidir.Qeyd edildiyi kimi bu, onların apardığı bölgüdür.

(2)-Bəzən həmin üzr gətirmə, başqalarına görə dinin əsaslarından olan etiqadı məsələdə olur, onlar isə bunu gizli və mütəşabih növdən edir və insanlara nisbətdə onda olan şübhənin böyük olduğu səbəbilə həmin məsələdə cahilliyi üzr edirlər.Çünki bəzi etiqadı və dinin əsasları ilə bağlı olan məsələlərdə şübhənin böyüklüyü səbəbilə bəzən müxalifə sərt mövqeyi tərk etməyi və həmin məsələdə xəta və cahilliyi üzr etməyi gərəkdirən ixtilaf baş verir.Buna dair müxtəlif yerlərdə bir sıra misallar çəkmişəm.Misal olaraq cəhənnəmin fani olması məsələsi.Əhli sunnənin etiqadına əsasən cənnət və cəhənnəm fani deyil və onun fani olduğunu yalnız cəhmiyyə firqəsi deyir.Buna rəğmən cəhənnəmin fani olduğunu deyən şəxs təkfir olunmur və zəlalətə düşməklə ittiham edilmir.Cənnətin fani olduğunu deyən isə fərqlidir.

Buna səbəb isə cəhənnəmin fani olduğuna dair şübhənin böyük olması və səhih və zəif olmasına nəzər salmadan bu barədə bəzi əsərlərin varid olmasıdır. Artıq buna dair sözlər bəzi məşhur imamlara nisbət edilmişdir.Həmin sözlər küfrü gərəkdirsə belə bu kimi məsələlərdə müxalif olana sərt mövqe tutulmur.Həmin məsələdə şübhə maneəsi olduğu səbəbilə onlar təkfir olunmurlar.Bəzən bu, dinin əsasları ilə bağlı olan digər məsələlərdə həmçinin olur və ona şaxəli məsələlərdə xəta edənin əhkamları tətbiq olunur.

Bu iki imamdan müəyyən məsələyə dair hər hansı bir söz varid olsa belə cahillik səbəbilə üzr məsələsini bütün digər küfrü gərəkdirən amillər üçün ümumi məzhəb etmək doğru deyil.

Bəzən iki imamın sözlərində anlaşılmaz məqamlar olur. Belə olan halda biz onlar üçün həmin məsələdə üzr axtarırıq.İnsanın ondan tutunub imamın kitabları və risalələrində gələn açıq-ayıdın sözlərini buraxması isə heç də haqq-ədalətdən deyil.

Habelə həmin sözün onun qədim görüşü olması mümkündür.Bu iki imamın digər imamlar kimi bəzi məsələlərdə bir neçə görüşə sahib olmaları mümkündür.

Bunu biləcəyin zaman mən sənə bu iki imamın bəzi sözlərini, onda gələn mənanı araşdırma və tədqiq etmə vasitəsilə bəyan edərək qeyd edəcəm.Müvəffəq edən Allahdır.

1-Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) demişdir: "Biz zəruri olaraq bilirik ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) ümmətinə dirilərdən, ölülərdən, peyğəmbərlərdən və digərlərindən heçə kəsə istər çətinlik halında imdad diləmə ifadəsi ilə istərsə də kömək istəmə ifadəsi ilə istərsə də digər sözlərlə dua etməyi buyurmamışdır.Habelə Uca Allah ölüyə və ölüdən savayı olana və digərlərinə səcdə etməyi şəriətdə buyurmamışdır.Üstəlik biz bilirik ki, O, bütün bu işləri qadağan etmişdir.Habelə bu işlər Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) haram etdiyi şirkdir.Lakin sonraki insanların bir çoxunda peyğəmbərlik məramlarına dair cahilliyin çoxluğu və elmin azlığı səbəbilə onlara Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi din bəyan edilməyənə qədər onları təkfir etmək mümkün olmamışdır.

Dedi: Bu səbəbdən, həmin məsələni bəyan etdiyim zaman İslam dininin əsasını bilər şəxs bunu qavramışdır.

Dedi: Bu, İslam dininin əsasıdır.Əshabımızdan olan bəzi böyük və arif şeyxlər deyərdilər: Bu, bizə bəyan etdiyin ən əzəmətli şeydir.Onlar bilirdilər ki, bu, dinin əsasıdır." Bitdi.

Dedim: Şeyx Abdur-Rahmən bin Həsən (rahiməhullah) "şərhu əsli-d-din va qaidətih" kitabında demişdir: "Şeyx (rahiməhullah) onlara müəyyən olaraq yalnız bəyan və isrardan sonra küfr hökmünü işlətməyi vacib edən amili qeyd etmişdir.Çünki artıq o, bir ümmət olmuşdur.Habelə Şeyxul-İslam onlara ibadətdə şirki qadağan etdiyi zaman bəzi alimlər onu təkfir etmişlər.Bu səbəbdən, onun yalnız dediyi tərzdə onlarla münasibət qurması mümkün olmuşdur.Məhz bu cür hadisələr şeyximiz Muhammməd bin Abdul-Vahhəbin

(rahiməhullah) başına gəlmişdir.Belə ki, şeyx onların Zeyd bin Xattaba dua etdiklərini eşitdiyi zaman yumşaq sözlə şirki rədd etməyə onları hazırlaşdıraraq və mənafeyi nəzərə alıb onları hürkütməyərək: "Allah Zeyddən daha xeyirlidir!",-demişdir.Doğrusunu bilən Uca Allahdır." (məcmuatu-t-təuhid ən-nəcdiyyə: 339-cu səh)

Şeyxul-İslamdan gələn bu sözlər həmçinin digər mənaya aid edilə bilər.Belə ki, Şeyxul-İslam (rahiməhullah) sahibini kafirə çevirən bu kimi bəzi məsələləri onun vaxtında müəyyən və gizli məsələlərdən hesab etmişdir.Bu səbəbdən, hüccət qalxmayana qədər cahillik səbəbilə bu işlərə düşənləri üzürlü etmişdir.Bununla bərabər Şeyxul-İslamın axirəti inkar edəni yaxud Allahın varlığını inkar edəni yaxud Allahı və ya Peyğəmbəri (salləllahu aleyhi və səlləm) və ya dini söyəni üzürlü etməsi qeyri-mümkündür.Çünki bütün bu işlərdə, məcbur edilən istisna olmaqla (təkfirə) mane olan heç bir şübhə yoxdur.

**2-Şeyxul-İslam (rahiməhullah) “ər-raddu aləl bəkri:212-ci səh” kitabında demişdir: “Mütəvatir xəbərlər və icma vasitəsi ilə gələni inkar edən şəxs hüccətin qaxlmasından sonra kafirdir.”**

**Dedim: İbn Teymiyyənin burada qəsdi, elmi əldə etmək üçün etinasızlığın olmayacağı şərtilə eşitmə amilinə dayanan dinin buyuruqlarıdır.Bu işləri danan şəxs yalnız hüccətin çatmasından sonra təkfir olunur.Belə ki, imanı eşitmə amilinə bağlayan hər hansı bir işi inkar edən şəxsə hüccət çatmayıbsa o, təkfir olunmaz.Ancaq əgər insana haqq çatar lakin o üz çevirərsə yaxud ona çatdığı zaman onu anlamadığını iddia edərsə onun heç bir üzürü olmaz.Doğrusunu bilən Allahdır.**

3-Habelə Şeyxul-İslam (rahiməhullah) "ər-raddu aləl bəkri: 259-cu səh" kitabında demişdir: Həmçinin təkfir Allahın haqqıdır və yalnız Allahın və Peyğəmbərin təkfir etdikləri təkfir olunur.Habelə müəyyən şəxsin təkfir edilməsi və onun qətlinin icazəli edilməsi müxalif olanı kafirə çevirən hüccətin çatmasına dayanır.Çünki heç də dindən hər hansı bir şey haqqında cahil olan hər bir şəxs kafir olmur.

Daha sonra Şeyxul-İslam Qudəmə bin Məzunun və övladlarına ölümündən sonra özünü yandırmağı əmr edən kişinin əhvalatlarını qeyd edib demişdir: "Bu səbəbdən mən, fitnə zamanı Allahın ərşin fövqündə olduğunu inkar edən hululi və inkarçılardan olan cəhmiyyəyə deyirdim: Əgər mən sizə müvafiq gəlsəydim kafir olardım.Çünki mən sizin sözünüzün küfr olduğunu bilirəm.Lakin siz cahil olduğunuz üçün mənə görə kafir olmursunuz."

Dedim: Şeyxul-İslamın bu sözlərindən yapışanlar üçün bu sözlərdə heç bir istinad yeri yoxdur.Həmin sözlərdə cahillik səbəbilə üzr məsələsinə dair yuxarıda qeyd olunan təfsilat vardır.Bu səbəbdən demişdir: "Çünki heç də dindən hər hansı bir şey barədə cahil olan hər bir şəxs kafir olmur." Bu, dindən hər hansı bir şey barədə cahil olan bəzi şəxslərin kafir olmayacağına dəlalət edir.Buna diqqət yetir, çünki onun anlama tərzi çox dəqiqdir.

Şeyx bunu, həmin vaxtda onlara gizli qalan məsələlərdən hesab etməsi etibarı ilə onları üzürlü saymışdır.Çünki onların əsrində batil dəvətçilərin şübhələri onlarda dərin iz buraxmışdır.Elə isə, şeyxin mütləq şəkildə tövhiddə cahilliyi üzr görməsi necə deyilə bilər?!

4-Habelə Şeyxul-İslam "iqtidau-s-sıratıl mustəqim:351-ci səh" kitabında demişdir: "Həmçinin bizə xəbər verilmişdir ki, Mədinənin ətrafında yaşayan bəzi insanlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbrinin yanına gəlib ondan müəyyən növ təamlar istəmişlər.Haşimilərdən bəzisi gəlib ona demişlər: Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunu sənə göndərib sənə demişdir: Bizim hüzurumuzdan uzaqlaş! Çünki bizim hüzurumuzda bu kimi şeylər istənilməz.Digərlərinin isə ehtyacları ödənmiş və onlara, ictihad etdikləri yaxud təqlid etdikləri yaxud elmdə səhlənkarlıq etdikləri səbəbilə bu kimi sözlər deyilməmişdir.Çünki digəri üçün bağışlanmayan cahil üçün bağışlanır.

Nəhayət demişdir: Lakin bilginin azlığı səbəbilə onun əfv edilib bağışlanması ümid olunur."

Dedim: Şeyxul-İslam bu sözləri əməli saleh bir kişinin qəbrinin yanında Allaha ibadət edən şəxs haqqında söyləmişdir.Bu, İslamda böyük bidətlərdəndir.Lakin bu, ixtilafdan kənar bir mövzudur.Ancaq buna ölüyə dua etmək və ibadətin növlərindən olan hər hansı bir şeyi ona yönəltmək kimi amillər birləşəcəyi zaman böyük şirkə çevriləcək.

Şeyxul-İslam burada, qəbirlərin yanında Allaha dua edib duaları qəbul olunan bu cahillərin üzürlü olduqlarını hesab edir.Onlarda olan şübhə həmin yerlərdə Allahdan istədikləri şeylərin hasil olması nəticəsində olur.Bu səbəbdən, onların bu işdə cahillikləri səbəbilə üzürlü olduqlarını hesab edir.Bu, Şeyxul-İslamın (rahiməhullah) etdiyi bir ictihaddır. Misirli şeyx Muhamməd Hamid əl-Fəqinin həmin məqamda çox gözəl izahı vardır.Şeyx (rahiməhullah) demişdir: Quran və

sunnənin nassları cəhalətin üzr qəbul etməyən cinayət olduğuna dair açıq-aydındır.Habelə əqli zərurət ilə bilinir ki, bir iş barədə cahil olan şəxsi həmin bu iş, istər o din ilə bağlı olsun istərsə də dünya ilə, yaramaz hala salır və heç də islah etmir.Allahın cinayət edib ondan ötrü çox ağır cəza verəcəyi bir işi, bidətlərin və cahiliyyat xurafatlarının bağışlanmasına səbəb olan üzr etmələri təəccüb doğurmaya bilməz."

6-Şeyxul-İslam ibn Teymiyyəyə (rahiməhullah) növbəti sözləri nisbət etmişlər: "Yozan (təvil edən), ictihad edən, xəta edən və təqlid edən şəxs etdiyi şirk və küfr əməllərə görə bağışlanır."

Dedim: Şeyx Abdullah Əbə Buteyn (rahiməhullah) bu sözləri nəql etdikdən sonra demişdir: "Bu, nəql edənin yalanı və şeyxin adından uydurulan sözdür.Çünki şeyx bunu yalnız Peyğəmbərin (salləllahu aleyhi və sælləm) qəbiri yanında dua etmək üçün çalışmaq və digər bəzi bidət əməllər haqqında söhbətin əsnasında demişdir.O, demişdir: "Bəzən onun əməli-saleh olduğunu etiqad edən lakin bunun yasaq olduğunu bilməyən adam gözəl niyyətinə görə savab alır və elmsizliyinə görə əfv olunur.Bu, geniş mövzudur.Belə ki, müəyyən hallarda bəzi insanların etdiyi və nəticədə bir növ fayda əldə etdiyi əksər bidət və yasaq olan ibadətlər, heç də şəriətdə icazəli olduğuna dəlalət etmir.Bəzən insan hər hansı bir işi yozur yaxud xəta edir yaxud ictihad edir yaxud təqlid edir və bu səbəbdən onun xətası bağışlanır və şəriətin buyurmadığı əməli şəriətin buyurduğu xeyirlə yanaşı etdiyinə görə savab qazanır."[97] Şeyx Abdullah davam edərək de-

---

[97]Bəzi alimlər Şeyxul-İslam ibn Teymiyyənin (rahiməhullah) bu məsələyə dair sözlərinə irad tutmuşlar.İnsan, cahil olarsa belə şəriətdə haram olan əməli etməklə gözəl niyyətinə görə necə əcr ala bilər?! Əslində Allaha yaxınlaşan hər bir yolunu azmış və nəfsi istəyinə uymuş *"özlərinin yaxşı işlər gördüklərini güman edirlər."* (əl-kəhf:104) Habelə beləsinə *"pis əməli gözəl özünə gözəl göstərilib"* (Fatir:8) Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun sunnəsinə müxalif olan əməlin qəbul edilməyəcəyini xəbər verib demişdir: "Kim bizim işimizdən olmayan bir əməl edərsə o, rədd edilər." Yəni, sahibinə qaytarılar.Burada üzr barədə ən uzağı, əməlin qəbul edilməsi deyil sunnəyə müxaliflik səbəbilə günahın olmayacağı deyilə bilər.Beləsinin əcr və savab şərəfinə nail olması isə doğru deyil.Allah Əbu Abdur-Rahmən ibn Məsuddan

mişdir: "Yozum yaxud ictihad yaxud xəta yaxud təqlid yaxud cəhalət səbəbilə küfr edən şəxsin bağışlanacağını iddia edən şəxsin sözü, heç şübhəsiz ki, Quran, sunnə və icmaya müxalifdir.(əd-duraru-s-səniyyə:9/239-241).

Habelə şeyx Abdullah Əbə Buteyn demişdir: "Artıq biz Şeyx Təqiyyuddinin sözlərini qeyd edib demişik ki, bağışlanmanın hasil olması yalnız bəzi bidətləri ictihad yaxud cahillik səbəbilə edən üçün ümid olunur.O, bunu böyük şirk və aşkar küfr edən şəxslər üçün deməmişdir.Əksinə şeyx demişdir: "Şirk kiçik olarsa belə Uca Allah onu bağışlamayacaq." (əd-duraru-s-səniyyə:9/244).

Habelə şeyx Abdullah başqa bir yerdə demişdir: "Şeyx bunu şirk deyil yalnız bidət olan işlərə dair demişdir.Bu onun şirk olmayan işlərə dair sözləridir.Habelə dedi: Şirkə gəldikdə isə Şeyxul-İslam onun barəsində demişdir: "Şirk kiçik olarsa belə bağışlanmayacaq.Bunu ondan şagirdi "əl-furu`" kitabının müəllifi nəql etmişdir." (əl-məsəilu va-r-rasəilu-n-nəcdiyyə:5/474).

Yuxarıda Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbdən buna bənzər sözlər nəql etmişəm.Orada demişdir: "Şeyxin sözləri mürtədlik deyil və sadəcə usul yaxud furu` olması fərqinə varılmadan cüz`i məsələlər haqqında bəhs edir." (məcmu ər-rasəil:5/221).

---

razı olsun o, belə demişdir: "Neçə-neçə xeyiri istəyənlər vardır ki, ona nail olmurlar."Şeyx Muhamməd Hamid əl-Fəqi "iqtidau-s-sıratıl mustəqim" kitabına verdiyi izahda Şeyxul-İslamın bu sözlərinə əlavə etmişdir.Habelə şeyximiz Hamud bin Abdullah ət-Tuveyciri (rahiməhullah) "ər-raddul qaviyy" kitabında şeyx əl-Fəqinin sözlərini bəyənmiş və ona həmin kitabda yer ayırmışdır.

Şeyx Süleyman bin Səhman (rahiməhullah) Aləvi əl-Haddədin Şeyxul-İslam ibn Teymiyyəyə nisbət etdiyi sözləri nəql etmişdir: "Əhli sunnə bu ümmətdən olan cahil və xəta edənin, şirk yaxud küfr əməl edərsə belə müşrik yaxud kafir olmayacağına icma etmişlər.Habelə həmin insana, xəta və cahilliyi səbəbilə tərk edəni kafir edən hüccət bəlli olmayınca o, üzürlü olacaq.Hüccət isə imamın yaxud onun nümayəndəsinin həmin adamı çağırması və ona heç bir qaranlıq məqam qalmadan açıq-aydın şəkildə ona doğru olanı bəyan etməsidir."

Ardından şeyx Süleyman bin Səhman Şeyxul-İslam ibn Teymiyyəyə nisbət edilən bu sözə əlavə edib demişdir: "Şeyxul-İslamın sözlərini təhrif edən bu şəxsin qeyd edilən tərzdə ondan nəql etdiyi həmin sözlərə ümumiyyətlə rast gəlməmişəm.Heç şübhəsiz ki, həmin adam şeyxin sözlərini özünə münasib olan tərzdə nəql edib onun bəzi sözlərini dəyişmişdir.Onun Şeyxul-İslamdan həmin ləfz ilə sabit olduğunu fərz etsək, yenə də onun sözləri bidətləri səbəbilə İslamdan çıxmayan bidət əhlinə, habelə dəlili bəzi insanlara gizli qalan nəzəri ictihadi məsələlər və dəvətdən kənar qalıb hüccətin çatmadığı şəxslərə aid ediləcək. Qaldı ki, tövhid və ibadətin xalis Allaha aid edilməsi məsələsi, onun vacib olduğuna dair nə bidət əhli nə də ki, digərlərindən olan İslam əhlindən heç kəs çəkişməmişdir. Həmin məsələlər dindən zəruri olaraq bilinir.

Nəhayət demişdir: "Onun cahil və xəta edənin təkfir edilməyəcəyinə dair sözlərindəki məqsəd, qədər və irca məsələləri, habelə bidət əhlinin dediyi digər sözlər kimi dəlili bəzi insanlara gizli qalan xüsusi məsələlərdir.Belə ki, bəzi

insanların sözləri Quranı və mütavatir sunnənin dəlillərini rədd etmək anlamına gələn küfr işləri şamil edir və nəticədə bəzi nassları rədd etmək anlamına gələn sözlər küfr olur lakin cahillik və nass yaxud mənası haqqında bilginin yoxluğu kimi maneənin olması ehtimalı səbəbilə onu deyən şəxsə küfr hökmü çıxarılmır.Çünki şər`i buyuruqlar yalnız çatandan sonra vacib olur.Bu səbəbdən həmin sözləri bidət əhli haqqında qeyd etmişdir.Artıq bunu vurğulayıb həmin məsələni qeyd etməsinin ardından kəlamçılardan bir qism insanların təkfir edilməsinə dair demişdir: “Lakin bu gizli məsələlərdə olacağı zaman təkfirin olmayacağı deyilə bilər. Zahiri və aşkar məsələlərdə yaxud dindən zəruri olaraq bilinən məsələlərdə baş verənə gəldikdə, onu deyənin küfründə tərəddüd edilmir.” İrəlidə ibn Səhmanın digər sözləri qeyd olunacaq.

7-Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) "əl-fətəva:3/229 -231" kitabında demişdir: "Lakin mənimlə daimə birlikdə olan insanlar bilirlər ki, mən, müəyyən bir şəxsin təkfir, təfsiq və günaha nisbət edilməsini ən çox qadağan edənlərdən biriyəm.Ancaq insanın üzərindən, müxalif olanı bəzən kafirə bəzən fasiqə bəzən isə günahkara çevirən hüccətin qalxması bilinəcəyi zaman fərqli olacaq.Habelə mən, Uca Allahın bu ümmətə onların xətalarını bağışladığını təsdiq edirəm.Bu isə, sözlü, xəbəri məsələlərdə və əməli məsələlərdə olan xətanı şamil edir.

Bir qədər sonra demişdir: "Təkfir təhdiddən sayılır.Bir söz Peyğəmbərin (salləllahu aleyhi və sələm) dediyini təkzib etmək olarsa belə bəzən insan İslamda yeni olduğuna yaxud uzaq bir çöllükdə yaşadığına görə üzərindən hüccət qalxmamış bir şeyi dandığı üçün təkfir olunmur.Bəzən olur ki, insan həmin naslları eşitmir yaxud eşidir lakin həmin nasslar onda sabit olmur yaxud xəta etməsinə rəğmən onda yozumu gərəkdirən digər bir əngəl ortaya çıxır."

Dedim: Şeyx Süleyman bin Səhman (rahiməhullah) "əl-əsinnətul hidəd fi kəşfi şubuhati aləvi əl-haddəd:159-cu səh" kitabında demişdir: "Şeyxin sözləri, müəyyən şəxsin hüccət qalxmamışdan öncə təkfir edilməyəcəyinə dair olmuşdur. Burada məqsəd qədər və irca məsələləri, habelə bidət əhlinin dediyi digər sözlər kimi dəlili bəzi insanlara gizli qalan xüsusi məsələlərdir.Belə ki, bəzi insanların sözləri Quranı və mütavatir sunnənin dəlillərini rədd etmək anlamına gələn küfr işləri şamil edir və nəticədə bəzi nassları rədd etmək anlamına gələn sözlər küfr olur lakin cahillik, habelə nass yaxud onun mənası haqqında bilginin

yoxluğu kimi maneənin olması ehtimalı səbəbilə onu deyən şəxsə küfr hökmü çıxarılmır.

Daha sonra Şeyxul-İslam ibn Teymiyyənin bəzi kəlamçıların küfrünə, habelə gizli və aşkar məsələlər arasında fərq qoymasına dair sözləri nəql edib demişdir: “Bizimlə bu ifratçılar arasında çəkişməmiz dəlili gizli qalan gizli nəzəri və ictihadi məsələlərdə deyil.Çəkişmə yalnız dua, sevgi, qorxu, ümid, yardım diləmə və ibadətin digər növləri kimi xalis Allahın haqqını övliya və salehlərə yönəltməkdədir. İslam dinindən zəruri olaraq bilinir ki, bu işlərə haqlı olan yalnız Uca Allahdır və bu növlərdən hər hansı bir şeyi Allahdan qeyrisinə yönəldən kafir və müşrikdir.” Sözləri bitdi.

Şeyx Süleyman bin Səhmanın (rahiməhullah) bundan sonra çox gözəl sözləri vardır.Həmin sözlərin çox dəyərli olması səbəbilə onu tam olaraq nəql edirəm.Belə ki, şeyx yuxarıda qeyd edilən mənbədə “163-164-cü səh” demişdir: “Bil ki, heç də hər xəta, ictihad və cahillik sahibinə bağışlanmır.Uca Allah bir çox kafirlərin cahil olduqlarını bununla birgə onların kafir olduqlarını xəbər vermiş və nəsraniləri cahil olaraq vəsf etmişdir.Halbuki müsəlman onların küfründə şübhə etmir.Biz qəti bilirik ki, günümüzdə olan yəhudi və nəsranilərin əksəriyyəti cahil təqlidçidirlər.Eyni zamanda onların kafir olduqlarını və onların küfründə şübhə edənin kafir olduğunu etiqad edirik.[98] Belə ki, dinin əsaslarında

---

[98] Bu, çox gözəl sözlərdir.Belə ki, hansı ümmətdən olursa olsun əsli kafir mütləq şəkildə cəhaləti səbəbilə üzürlü deyil.Hüccətin catması və İslama daxil olmadan sonra zahiri və aydın məsələlərdə həmçinin cəhalət səbəbilə üzr yoxdur. Gizli məsələlərdə isə cahillik üzrdür.Bu təfsilatı daimə göz önündə etsən bir çox qaranlıq məqamlar sənə aydın olar.

şübhə etməyin küfr olduğuna Qurani Kərim dəlalət edir.Şübhə, iki şey arasında tərəddüddür.Buna misal, Peyğəmbərin nə doğru olduğuna nə də yalan olduğuna əmin olmaqdır.Habelə qiyamətin qopub qopmayacağına əmin olmaqdır.Habelə namazın nə vacib olduğunu nə də ki, vacib olmadığını etiqad etmək, zinanın nə haram nə də ki qeyri-haram olduğuna etiqad etməkdir.Bu, alimlərin icması ilə küfrdür və durumu bu cür olan şəxs üzürlü deyil.Çünki bunlar Allahın hüccətləri və aydın dəlillərini anlamamışlar. Çünki insan, anlamasa belə hüccətin çatmasından sonra üzürlü deyil.Məgər vəhdətçiləri və hululiləri aşkar küfrə və böyük şirkə və aləmlərin Rəbbinin həqiqi varlığını danmağa düşürən yalnız və yalnız onların bu mövzuda ictihad edib xəta etmələri və nəticədə zəlalətə düşub digər insanları zəlalətə aparmaları deyil? Məgər fətva əhlinin yekdil görüşü ilə Həllacın qətlə yetirilməsi, yalnız onun zəlalət üzərində qurulmuş ictihadı səbəbilə deyil? Məgər qaramitə firqəsinin küfrü və onların rüsvayçı işlərdən və İslamı pozan amil-lərdən ibarət olan məsləki yalnız iddia etdikləri ictihad nəticəsində olmamışdır? Məgər rafizilərin küfr, şirk, on iki imama və başqalarına ibadət etmək və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabını və möminlərin anasını söymək kimi caiz saydıqları işlər iddia olunan ictihad nəticəsində hasil olmamışdır?! Bunlar həmin adamın,-Həddad qəsd edilir,- və ona bənzər şəxslərin: Hər bir xəta bağışlanın!-sözündə sələfidirlər.Bu, qaçılmaz sözdür.Həmin sözün ümumiləşdi-rilməsi, Allahın varlığına, Onun rübubiyyəti, üluhiyyəti, qəza və qədərinə imanı, habelə Onun kamilliyi ilə seçilən zatı və feli sifətlərinə imanı və icad olmamışdan öncə hadisə və kainatlara dair Onun elmi məsələsi kimi dinin bütün

əsaslarında xəta səbəbilə təkfir və günahın olmayacağını ifadə edir.Bütün bu işlərdə xəta səbəbilə günahın və təkfirin olmasına dair sözə əngəl olmaq, Allahın zatını, rübubiyyətini, ad və sifətlərini, Onun üluhiyyətdə tək olduğunu dananların, habelə ifratçı qədərilərin dediyi kimi yaradılmamışdan öncə Allah yaradılanı bilmir deyənlərin, hadisələri göz cisimləri və ulduzlara bağlayanların, habelə nur və zülmət əsasını deyənlərin kafir olduqlarını rədd etməyi ifadə edir.Əgər bu dinsiz bütün bu deyilənlərə riayət edərsə o, yəhudi və nəsranilərdən daha kafir və azğın birisi olar. Lakin əgər o, bu işlə, yalnız aləmlərin Rəbbinin qadır olduğu şeyləri ölülər və qaib şəxslərdən istəməkdə öz əksini tapan çəkişmə məsələsi arasında fərqli çəhətin olduğunu iddia edərsə, qoy həmin fərqi və bunun doğru olduğuna dəlili bizə ərz etsin! Əgər bunu etməsə onun qaydası və qurduğu təməli batil olar və elm əhli onun şübhə atan yalançı olduğunu, elm və din əhlindən olmadığını, habelə İslamı və müsəlmanları tanımayan və müsəlmanları müşriklərdən ayırmayan şəxs olduğunu bilərlər. Üstəlik onun azğınlıq, cəhalət və açıq-aydın şübhə zülmətində olduğu bilinəcək.Şeyxul-İslamın (rahiməhullah) sözlərini yalnız onun kəlamlarını araşdıran və onun əsaslarını bilən şəxs anlayıb qavraya bilər.Artıq Şeyxul-İslam bir sıra yerlərdə şəriətin dəvətindən kənar qalıb xüsusi məsələlərdə hüccətin çatmadığı şəxsin, bacardığı qədər Allahdan qorxacağı və imkanı çərçivəsində çalışacağı zaman xətasının bağışlanacağını açıq bildirmişdir.Qəbirlərə sitayiş edənlərin iddia etdiyi təqva və ictihad haradadır?! Habelə ölülərə və qaib şəxslərə dua edənlər.Bu necə ola bilər? Axı məscidlər, mədrəsələr və evlərdə Quran oxunur, habelə Peyğəmbərin

(salləllahu aleyhi və səlləm) sunnəsi toplanıb kitablar halına salınmış və onun səhihliyi və sabit olması məlum olmuşdur!”.

Şeyxin (rahiməhullah) sözləri burada bitir.Həqiqətən də, həmin sözlər çox dəyərli və dəqiqdir.Bu kitaba nəzər yetirən hər bir şəxsə bu sözlərdə dayanıb onu dəfələrlə oxumasını tövsiyə edirəm.Ola bilsin ki, Uca Allah onu bu böyük məsələdə yanlışlığa düşməkdən qorusun.Habelə şeyxin buna bənzər bir çox sözləri və nəzm şəklində yazılan kəlamları vardır.Həmin sözləri mən “tənibul anid” kitabında toplamışam.Uca Allah həmin kitabın tamamlanmasını asanlaşdırsın!

Şeyxul-İslamın (rahiməhullah) yuxarıda keçən sözləri: “Bəzən insan İslamda yeni olduğuna yaxud uzaq bir çöllükdə yaşadığına görə üzərindən hüccət qalxmamış bir şeyi dandığı üçün təkfir olunmur.” Bu, danma mənasının yer alması səbəbilə eşitmənin hasil olması amilinə bağlı olan məsələlərdə olur.Şəriətin bəzi nassları, bir qism insanlar istisna olmaqla diqər qism insanlara bəlli olmur.Bəzi hallarda isə bəlli olur lakin şeyxin dediyi kimi bir sıra maneələr ona əngəl olur: “Bəzən olur ki, insan həmin naslları eşitmir yaxud eşidir lakin həmin nasslar onda sabit olmur yaxud xəta etməsinə rəğmən onda yozumu gərəkdirən digər bir əngəl ortaya çıxır.” Bəzən bu kimi əngəllərə məruz qalan həmin nasslar tövhidin əsasında deyil sadəcə şəri buyuruqlarla əlaqəli olan məsələlərdə olur.Əgər biri qiyamət və həşr gününü inkar edib danarsa, ağıllı insanın beləsi haqqında: Ola bilsin ki, ona bunu isbat edən dəlil çatmamışdır,-deməsi mümkündürmü? Habelə Uca Allahın varlığını inkar etmək yaxud Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söymək yaxud ibadətin növlərindən olan hər

hansı bir şeyi Allahdan qeyrisinə yönəltmək kimi işlər.Əgər biri İslam dininə mənsub olar və bu kimi sözlər ondan sadir olduğu zaman: Mən bu sözün hökmünü bilmirəm!-deyərsə, ona deyəcəyik: Belə olan halda sən ümumiyyətlə "lə iləhə illəllah" əhlindən deyilsən.Çünki bu kəlmə əvvəlcədən yalnız bu işlər haqqında bilgi ilə tamamlanır.Bu sözlər, cahilliyi üzr olaraq ümumiləşdirən hər bir şəxs üçün gərəklidir və onlar bu söz qarşısında acizdirlər.Bununla birgə təkəbbürlük və inadkarlığın son həddi olaraq onlardan heç biri, bu kimi sözlər deyən şəxsin cahilliyi səbəbilə üzürlü olmayacağını açıq bildirməmişdir.Əksinə onlar bu kimi şəxsləri üzürlü saymışlar.Bu isə,-Allah qorusun-riddədir.

Habelə Əfqanıstandan olan bəzi tövhid əhlindən olan qardaşlarımız bir neçə il öncə məndən cahilliyi səbəbilə kafiri üzürlü sayanın hökmü barədə soruşmuşlar.Həmin şəxs İslamı pozan on amildən olan həmin qeyd edilən amilə düşürmü: "Müşrikləri təkfir etməyən yaxud onların küfründə şübhə edən yaxud onların yolunu doğru sayan kafirdir"?

Cavab olaraq demişdim: Bu məsələ, təkfir olunan şəxsin küfr səbəbinə dayanır.Əgər insan, Allahı və Peyğəmbəri söymək yaxud dini söymək yaxud axirət gününü inkar etmək kimi sahibini kafir edən açıq-aşkar və dindən zəruri olaraq bilinən bir səbəbdən ötrü təkfir olunarsa, şübhə yoxdur ki, beləsi üçün cahilliyi üzr gətirib yaxud bunu üzr gətirməməsi fərq etmir və həmin şəxsin küfründə şübhə edən təkfir olunur.Lakin əgər küfrün səbəbi, müəyyən sözü deyənin təkfir olunmasına dair ixtilaf olan məsələlər kimi gizli olarsa yaxud qədər, sifətlər, irca və bu kimi məsələlərdə bəzi insanlara qizli qalan məsələlərdə olarsa, beləsini təkfir

etməyən şəxs bu kimi işlərdə geniş ixtilafın olması səbəbilə təkfir olunmaz.Küfr vəsfi insanda yalnız yəqinliklə bilinən bir işdə sabit olur.Bəzən məşhur məzhəblər arasında ictihad nəticəsində bilinən bəzi küfr amillərində ixtilaf baş verir. Lakin tərəflərdən birinin digərini təkfir etməsi halı baş verməmişdir.

Habelə Şeyxul-İslamın (rahiməhullah) bütün öncə qeyd edilən sözlərindən məna baxımından kənar çıxmayan digər sözləri vardır.Həmin sözlərə öncə qeyd edilənə verilən cavablar veriləcək.Allah daha yaxşı bilir.

## Fəsil

## Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbin sözlərində olan qaranlıq məqamlara dair gətirilən şübhələrin ifşası

Artıq yuxarıda şeyx Muhammməd bin Abdul-Vahhəbin (rahiməhullah) tövhidin təməlində cəhalətin üzr olmadığına dair açıq-aydın və şübhə yeri qoymayan kəlamları qeyd edilmişdir.Lakin qeyd etdiyim kimi mən bu iki şeyxin həmin sözlərini dəstəkləyən və üzdə ona müxalif olduğunu ifadə edən bütün sözlərini nəql etmək qərarına gəldim.Bilmək lazımdır ki, Şeyxul-İslamın müəyyən ifadələrində onun cahilliyi üzr gördüyü anlaşılır.Artıq yuxarıda, bir alimin sözlərində ixtilaf olacağı zaman həmin sözlərə doğru yanaşmanın yolunu vurğulamışam və bunu yenidən təkrar etməyə lüzum yoxdur.

Bir alimin bir çox görüşlərə sahib olması heç də qəribə iş deyil.Üstəlik bu, alimin fəzilətinə və onun haqqı axtarıb araşdırdığına bir göstəricidir.Bir sıra səhabələrin, habelə onlardan sonra gələn tabiin və imamların, fətva verdikləri məsələlərdən dönmələri çox sayda bizə nəql edilmişdir.Hətta bəzən bir imamdan iki görüşdən çox rəvayətlər gəlir.Bəzən bir imamdan dörd, beş yaxud altı rəvayət nəql edilir.Bütün bunlar dəlilin çatması və çatmaması yaxud səhihliyi və zəifliyi yaxud bir şeyə dəlalət etməsi və etməməsi, habelə digər üzrlər üzərində qurulur.Oxucunun nəzərinə Şeyxul-

**İslam Muhamməd bin Abdul-Vahhəbin bu məsələyə dair şeyxin digər sözlərinə dəlil və sübutsuz müxalif olub ondan üz çevirənlərin yapışdıqları bəzi qaranlıq qalan sözlərini çatdırıram.**

1-Şeyx (rahiməhullah) "məcmu`əl-muəlləfət:12-ci səh" kitabının beşinci qismində ona nisbət olunan bəzi iddiaları rədd etdiyi əsnada demişdir: "Həmin sözlərdən: Güya mən dörd məzhəb kitablarını rədd edir, habelə insanların altıyüz ildən bəri din üzərə olmadıqlarını deyir, habelə ictihad iddiasında olduğumu və təqliddən çıxdığımı deyirəm.Habelə alimlərin ixtilafının əzab olduğunu deyir və salehlərlə təvəssül edənləri, Buseyrini, onun; ey yaratılanların ən hörmətlisi!-sözünü dediyinə görə təkfir edirəm və əgər iqtidarında olsaydım Peyğəmbərin (salləllahu aleyhi və səlləm) günbəzini sökərdim, habelə iqtidarında olsaydım Kəbənin novunu (Kəbənin damında yağış suları və damın yuyulması zamanı suyun axması üçün yerləşdirilən boru) çıxarıb orada ağacdan digər bir nov edərdim sözlərini deyirəm.Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbrini ziyarət etməyi və valideyin və başqa adamların qəbrini ziyarət etməyi yasaq edirəm.Habelə mən Allahdan qeyrisinə and içəni təkfir edir, habelə ibn əl-Fərid və ibn Arabini təkfir edirəm və "dəlàilul xayrat" və "raudu-r-rayyəhin" kitabını yandırıram və sonuncu kitabı "raudu-ş-şəyətın" adlandırıram.Bütün bu məsələlərə dair deyəcəyim cavab: Allah şahiddir ki, bu, böyük böhtandır!"

2-Habelə iddialara cavab olaraq demişdir "25-ci səh": "Yaxud üzərindən hüccət qalxmayan cahili təkfir etməyim. Bu, böyük böhtandır.Onlar bununla insanları Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dinindən uzaqlaşdırmağı istəyirlər."

3-Habelə demişdir "60-cı səh": "Biz yalnız şirkin batil olmasına dair hüccəti bəyan edəndən sonra Allaha üluhiyyətdə şərik qoşan şəxsi təkfir edirik."

4-Habelə “əd-duraru-s-səniyyə:1/66” kitabında demişdir: “Əgər biz Abdul-Qadirin qəbiri üzərində olan bütə, habelə Əhməd Bədəvi və onların mislində olanların qəbiri üzərində olan bütə cahillikləri və onların diqqətinə bunu çatdıranın yolxuğu səbəbilə ibadət edəni təkfir etmiriksə, necə olur ki biz, bizim yanımıza hicrəti etməyəcəyi zaman Allaha şərik qoşmayan şəxsi təkfir edir yaxud onun kafir olub savaşa məruz qalacağını deyirik.Allah şahiddir ki, bu, böyük böhtandır.”

Dedim: Qəbirlərə ibadət edən və ona müxtəlif qurbanlar vasitəsilə yaxınlaşan bütpərəst cahillərin üzürlü olduğunu deyən bəzi şəxslər Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin bu ifadələrindən yapışmışlar.Bu şəxslərdən biri, Allahın düşməni və iblisin şagirdi olan Davud bin Circis əl-İraqidir.Həmin adam iddia etmişdir ki, Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) tövhiddən cahil olan şəxsi təkfir etmirdi.Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən Ali-ş-Şeyx “minhəcu-t-təsis va-t-təqdis” kitabında demişdir: “İraqlı və onun batil əhlindən olan qardaşları şübhə ataraq şeyxin cahili təkfir etmədiyini və onun üzürlü olduğu dediyini irəli sürmüş və təfsilata varmadan bunu yığcam olaraq təqdim etmişlər.Onlar Quranın ayələrini və Peyğəmbərin (salləllahu aleyhi və sələm) hədislərini dəf etmək üçün bu şübhəni özləri üçün bir qalxan etmiş və onların sələfi olan qəbirə sitayiş edənlər və müşriklər etdiyi kimi Allahın muvahhid qullarına tənə etmişlər.Qayıdış Allahadır.Məhz O, qulları arasında ixtilaf etdikləri işlərdə Hakimdir.”

Şeyxul-İslam ibn Teymiyyənin (rahiməhullah) bəzi sözlərini yanlış təqdim edən Davud bin Circisin etdiyi kimi bəzi başqa insanlar Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin sözlərini yanlış təqdim etmiş və nəfsi istəyinə uyğun gələn sözləri götürüb şeyxin bütün sözlərini kamil surətdə cəm etməmişlər.Artıq yüz ildən uzun zamandan öncə şeyx İshaq bin Abdur-Rahmən bin Həsən bin Muhamməd bin Abdul-Vahhəb (rahiməhumullah) şübhə əhlinin sözlərinə dəyərli və faydalı bir risalə ilə cavab vermişdir.Şeyximiz Abdullah bin Sə`di əl-Ğamidi həmin risaləni "aqidətul muvahhidin va-r-raddu alə-d-dulləl val mubtədiin" kitabında yerləşdirmişdir.Həmin risaləni adı çəkilən kitabın "148-163-cü" səhifələrində görə bilərsən.Şeyxin bəzi müxaliflərdən nəql etdiyi sözlərini nəzərinizə çatdırıram: "Növü təkfir edir lakin müəyyən şəxsi yalnız bildirişdən sonra qəsd edirik. Bizim etimad etdiyimiz əsas, şeyx Muhammədin bəzi risalələrdə Kuvvaz günbəzinə, habelə Abdul-Qadirə ibadət edən cahilləri, bunu onların diqqətinə çatdıran olmadığına görə təkfir etməkdən imtina etməsidir." Şeyx İshaq bu sözü rədd edərək demişdir: "Nəzər yetirsən, təəccüblü işlər görərsən! Ardından Allahın səni iman gətirdikdən sonra küfrə düşməkdən salamat etməsini dilə! Necə də bunların halı Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb haqqında gələn məşhur əhvalatdakı şəxsə bənzəyir! Belə ki, şeyx günlərin birində dinin əsasını vurğulayır və ona aid olan məsələləri bəyan edir.Onun məclisində olan bir kişi isə heç bir şey soruşmur, təəccüblənmir və məsələni araşdırmır. Nəhayət bəzi sözlər gəldiyi zaman həmin adam deyir: Bu nədir? O, necə olur? Şeyx cavabında deyir: Allah vursun səni! Neçə gündən bəri söhbət edirik, səni isə nə anlayır nə də ki onun

haqqında soruşursan.Nəhayət bir yanlışlıq gəldiyi zaman onu dərhal sezirsən! Sən milçək mislindəsən.Yalnız murdar yerə qonursan.Yaxud şeyxin dediyi sözlər.Biz isə deyirik: Allaha həmd-sənalar olsun! Biz Ondan yardım və dürüstlük diləyir və yalnız şeyximiz şeyx Muhamməddin "ifədətul mustəfid"də dediyi, habelə onun nəvəsinin iraqlıya rəddiyəsində dediyi kimi deyirik.Habelə bu, onlardan öncəki dinin imamlarının sözüdür.İslam dinindən zəruri olaraq bilinir ki, dinin əsasları məsələsində mənbə Quran, sunnə və ümmətin mötəbər icmasıdır.Bu yol, səhabələrin yoludur.Bu məsələdə mənbə kimi hər hansı bir alim ola bilməz.Əgər biri bu təməli, şübhənin dəf etməyəcəyi surətdə qavrayar və qəlbini sabit edərsə imamlarının bəzi kitablarında gördüyü bəzi müəmmalı sözlər ona yüngül gələr.Çünki Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) savayı məsum yoxdur. Bizim bu məsələmiz, Allaha ibadət etmək və Ondan başqasına ibadət etməkdən uzaq durmaq, habelə Allahdan qeyrisinə ibadət edənin dindən çıxaran böyük şirk etməsi kimi dinin əsaslarının ən başlıca əsasıdır.Allah məhz ondan ötrü peyğəmbərlər göndərmiş, kitablar nazil etmiş və insanların üzərindən Peyğəmbər və Quran vasitəsilə hüccət qalxmışdır. Habelə şirk edənin təkfir ediləcəyi və tövbə etməyəcəyi halda öldürüləcəyi zaman bu əsasa dair cavabı dinin imamlarının izahında görə bilərsən.Onlar dinin əsaslarında (cahilə) bildirməni qeyd etmir və bunu yalnız, qədərilər və murciələr kimi bəzi bidət əhlinin çəkişdikləri məsələlər yaxud ayırma və qovuşdurma kimi gizli məsələlər mislində dəlili bəzi müsəlmanlara gizli qalan gizli məsələlərdə qeyd edirlər.Qəbirə sitayiş edənlərin müsəlman olmadıqları və İslam anlamına daxil olmadıqları bir halda

onlara nə bildirəcəklər? Məgər şirklə birgə əməlmi qalır? Uca Allah buyurur: *“Dəvə iynənin gözündən keçməyənə qədər onlar cənnətə girə bilməzlər.”*[99] *“Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara atdığı bir şeyə bənzəyir.”*[100] *“Allah Özünə şərik qoşulmasını bağışlamaz”.*[101] *“İmana küfr edənin əməli puça çıxar”.*[102] Habelə digər ayələr.Lakin bu etiqad çox yaramaz bir etiqadı gərəkdirir.Həmin etiqada əsasən bu ümmətin üzərindən Peyğəmbər (salləllahu aleyhi və səlləm) və Quranla hüccət qalxmamışdır.Onlara kitabı və Peyğəmbəri unutmağı gərəkli edən bu yaramaz anlama tərzindən Allaha pənah aparırıq.Üstəlik risalət və Qurandan kənar qalıb cahiliyyat üzərə ölən fətra əhli icma ilə müsəlman adlanmırlar və onlar üçün bağışlanma istənilmir.Elm əhli yalnız onların axirətdə əzab görəcəklərinə dair ixtilaf etmişlər.”

Daha sonra “157-ci” səhifədə şeyx Abdul-Lətifin iraqlıya rəddiyəsini nəql edib demişdir: “Şeyx Abdul-Lətif bin Abdur-Rahmənin bu məsələyə dair sözləri çoxdur.Biz onun sözlərindən az bir qismini qeyd edəcəyik.Çünki məsələ yekdildir, məqam isə müxtəsərliyi tələb edir.İndi isə şeyxin sözlərindən Kuvvaz günbəzinə ibadət edənləri və şeyxin beləsini təkfir etməkdə dayandığını dəlil gətirənlərin şübhələrini sənin diqqətinə çatdıraq.İlk öncə cavabın məzmununu və sözlərin gətirilmə səbəbini, habelə şeyx Muhamməddin və bu əhvalatı ondan nəql edən şəxslərin bunu,

[99] əl-Əraf:40.
[100] əl-Həcc:31.
[101] ən-Nisə:48.
[102] əl-Maidə:5.

əleyhdarların iddia etdiyi kimi şeyxin müsəlmanları təkfir etməsi məsələsinə bəraət olaraq qeyd etdiklərini vurğulayırıq.Ancaq onların dediyi sözlər özlüyündə adi bir iddiadır və hüccət olaraq yararsızdır.Onun Quran və sunnədən dəlil və əsas üzərində olması gərəkdir.Uca Allahın, bəsirətini açdığı və təəssübkeşlikdən salamat qalan, habelə bu məsələni araşdıran şəxs bu məsələləri açıq bəyan etmiş və şeyxin bütün təliflərində müəyyən şəxsi təkfir etdiyinə və bundan heç bir şeydə dayanmadığına əmin olmuşdur.Gəlin işarə etdiyimiz cavabın məzmununa qayıdaq.Şeyx Abdul-Lətif (rahiməhullah) iraqlının "İki həramı və onun sakinlərini təkfir etdiniz" sözlərini qeyd edib həmin sözlərə cavab vermişdir.

Bir qədər sonra demişdir: İraqlı dedi: "Məlumdur ki, xəta etsələr belə bu mövzuda danışmış müsəlmanları təkfir etməyə mane olmaq şəriətin ən öndə məqsədlərindəndir. Belə ki, o ictihad edib doğru qərar çıxaracağı zaman iki, xəta edəcəyi zaman isə bir əcr qazanır." İraqlının sözləri bitir.Cavab olaraq deyiləcək: Bu sözlər, onun bu məsələyə dair iki təhrif etdiyi sözlər növündən olan bir təhrifidir. Birinci: O, sualı düşürmüş və Əhli sunnə val cəmaat ilə xəvaric və rafizilər arasında ixtilaflı və çəkişmə doğuran məsələlərdə təkfiri gərəkli etmişdir.Belə ki, onlara müxalif olduqlarına görə onlar öz bidət qaydalarına və etiqadlarına əsasən müsəlmanları və Əhli sunnəni təkfir etmişlər.Bu adam isə qəbirlərə dua etməyin, onlara tapınıb onlardan yardım diləməyin bu növdən olmadığı və müsəlmanların bu işdə çəkişmədiyi, üstəlik bunun şirk olması icma olan məsələ olduğu deyiləcəyindən qorxaraq bunu düşürmüşdür.

Bir qədər sonra şeyx Abdul-Lətif dedi: Şeyx Muhamməd yalnız Quran və sunnədə və müsəlmanların icması ilə təkfir olunan şəxsi təkfir edir.Məsələn, öz dinini dəyişən və mələklərə, peyğəmbərlərə, salehlərə ibadət edib onlara dua edən cahiliyyat əhlinin əməlini edən şəxslər.Uca Allah belələrini təkfir etmiş və onların qanları, malları və nəsillərinin toxunulmazlığını aparmışdır.Çünki onlar peyğəmbər yaxud övliya yaxud bütə ibadət etmişlər.Qurani Kərimin dəlalət etdiyi kimi onların arasında heç bir fərq yoxdur, onlar hamısı kafirdir." Şeyxin sözləri bitdi.

Dedim (deyən şeyx İshaqdır): Bu, Kuvvaz günbəzinə ibadət edən cahilə dair onun sözünü ən ətraflı bəyan edən cavablardan biridir.Çünki o, bu işdə cahili və qeyrisini istisna etməmişdir.Şübhəsiz ki, Allaha şərik qoşanın mütləq şəkildə təkfir edilməsi Quranın üslubudur.Şeyxin bəzi cavablarında bu işdə dayanması, müəyyən bir işdən ötrü olmasına aid edilir.Habelə onun digər yerdə dayandığını görə bilərsən: "Dünyaya meyl salana (cahilə) gəldikdə isə onun halından agah deyiləm."[103] Həqiqətən də, Quran və

---

[103] Şeyxin sözləri: "İslam iddiasında olub şirkdən olan dəhşətli işlər edən şəxsə Allahın ayələri oxunduğu zaman ona qarşı təkəbbürlük edir.Beləsi müsəlman deyil.Lakin nəsihət edən insanın olmadığı və onun Allahın Peyğəmbərinə nazil etdiyi elmi tələb etmədiyi halda cəhaləti səbəbilə bu işləri edən, üstəlik dünyaya meyl salıb nəfsi istəklərinə uyan şəxsin halından agah deyiləm."(məcmu`əl-muəlləfət, qismu-s-səlis, qismul fətəva:37-ci səh).

Bu sözlər, şeyxin cahilin halına dair dayanmasını açıq göstərir.Lakin sonralar şeyxə onun hökmünə dair qəti görüş bəlli olmuşdur.Bu səbəbdən, şeyxin ən məşhur təliflərdə cahilliyin üzr olmadığını qeyd etdiyini görə bilərsən.Elmdə möhkəm olan alimlərin adətinə uyğun olaraq, onlar tədqiq və ictihad dərəcəsinə catmayana qədər təliflər yazmağa girişmirlər.Şeyxin cahilliyin üzr olmadığını vurğuladığı təliflərdən "kitəbu-t-təuhid", "kəşfu-ş-şubuhat", "ər-raddu alə-r-rafida" və digər kitablardır.Şeyxdən cahilliyin üzr olması haqqında gələn bütün

sunnədən olan dəlillər, habelə Şeyxul-İslamın və ibnul Qayyimin sözləri ilə birgə gələn şeyxin bir çox yerdə dediyi sözlərin necə tərk edilməsi təəccüb doğurmaya bilməz.Misal üçün şeyx deyir: Əgər birinə Quran çatarsa artıq onun üzərindən hüccət qalxmış olar.Bunun müqabilində isə bir yerdə yığcam şəkildə gələn sözlər qəbul edilir."

Dedim: Bu, şeyx Muhamməmədin nəvəsinin verdiyi açıqlamadır.Belə ki, şeyxin bəzi sözlərində onun cahillik üzündən qəbirlərə ibadət edənləri üzürlü etməsi gəldiyi zaman nəvəsi, onun həmin adamları ola bilsin ki, müəyyən bir vəziyyətin olması səbəbilə təkfir etmədiyini və bu işdə dayandığını qeyd etmişdir.Ola bilsin ki, onu bu işdə dayanmağa sövq edən səbəblərdən biri də, şeyxin dəvətin başlanğıcında məsləhət olana riayət etməsi olmuşdur.Şeyx zərəri dəf etmək və insanların qəlblərini haqqa isitmək məqsədilə onların təkfir olunacağını açıq bildirməmişdir. Şeyx dəvətinin ilk çağlarında məhz bu cür hərəkət edirdi. Belə ki, şeyx insanların Zeyd bin Xattaba dua etdiklərini eşitdiyi zaman demişdir: Allah Zeyddən daha xeyirlidir! Bununla da o, məsləhəti nəzərə alıb insanları qaçırmamaq məqsədilə onları yumşaq sözlə şirki rədd etməyə alışdırırdı.

Bu cür davranış icazəlidir və şəriətdə öz təsdiqini tapmışdır.Üstəlik Quranda buna bənzər dəlil vardır.Uca Allah buyurur: *"Müşriklərin Allahdan başqalarına tapındıqlarını söyməyin.Yoxsa onlar da elmsiz olaraq düşməncəsinə Allahı söyərlər.Biz hər bir ümmətə öz əməllərini beləcə*

---

nəqllər isə fətvalar və məktublaşmalarda gəlmişdir.Bu isə, irəlidə qeyd ediləcəyi kimi dəvətin ilk çağlarına təsadüf etməsi amilinə aid edilir.

*gözəlləşdirdik.Sonra isə onların dönüşü öz Rəbbinə olacaq, O da nə etdikləri barədə onlara xəbər verəcək."*[104] Hafiz ibn Kəsir təfsir kitabında (3/308) demişdir: "Bu, daha üstün gələn zərərdən ötrü mənafeyi (məsləhəti) tərk etmə növündən bir işdir."

Bu səbəbdən, şeyxdən nəql olunan bir çox ifadələrə yuxarıda nəql olunan və nəql olunmayan bəzi sözlərin müxalif olduğunu görə bilərsən.Bu sözlərdən bəzisi:

Şeyx həmin risalələrdə ibn Arabi və ibn əl-Fəridın təkfir edilməsini ona atılan böhtan hesab etmişdir.Artıq şeyx digər yerlərdə onların kafir olduğunu vurğulamış və bir çox risalələrində ibn Arabi və ibn əl-Fəridın kafir olduqlarına dair alimlərin icmasını nəql etmişdir.Belə ki, şeyx "məcmu` əl-muəlləfət:72-ci səh" kitabının beşinci qismində demişdir: "Həmin şəxsdən məşhur olan isə onun ibn Arabinin dini üzərə olmasıdır.Alimlər isə onun firondan daha kafir birisi olduğunu qeyd etmişlər.Hətta ibn əl-Muqri əş-Şəfii demişdir: İbn Arabinin tayfasının küfründə şübhə edən kafirdir."

Habelə "189-cu səh" demişdir: "Həmçinin zəlaləti ən böyük olan insanlar, Mi`kal və digər insanların sufiləridir. Məsələn, Musa bin Cəuanın övladı, Sələmə bin Məni` və başqaları.Onlar ibn Arabi və ibn əl-Fəridın məzhəbinə tabe olurlar.Alimlər isə ibn Arabinin "vəhdət əl-vucud" məzhəbinin imamlarından olduğunu qeyd etmişlər.Həmin tayfanın küfrü isə yəhudi və nəsranilərin küfründən daha tükürpədicidir.Muhamməddin (salləllahu aleyhi və səlləm) dininə girməyib

[104] əl-Ənam:108.

“vəhdət əl-vucud” dinindən kənar durmayan hər bir şəxs kafirdir və İslam dinindən uzaqdır.”

Habelə şeyx Abdullah bin İsa bin Abdur-Rahmən şeyxin həmin risaləsinə və orada dediyi sözlərə razılığını bildirərək ona yazıb demişdir “öncəki mənbə 193-ci səh”: “Vəhdəti vucud əqidəsində olan nasslara müxalif olan “əl-fusus” kitabının müəllifi ibn Arabi və Allahın dininə qarşı çıxan və haqqı batil ilə rədd edən ibn əl-Fərid adlı şəxslərə və onların məzhəbində olanlara gəldikdə isə, bilmək lazımdır ki, ibn Arabi və ibn əl-Fərid, onları kafirə çevirən bir məslək üzərədirlər.Onları bir çox əməl sahibi alimlər təkfir etmişlər. Bunlar elə sözlər deyirlər ki, nəinki həmin məsləki tutub getməkdən hətta həmin sözləri dilə gətirməkdən belə qorxuram.”

Şeyx (rahiməhullah) “məcmu`:25-ci səh” kitabının fətvalar qismində onun dönəmidəki müşriklərin halını pislədiyi əsnada demişdir: “Onlardan bir qismi ibn Arabi və ibn əl-Fəridin məzhəbini müdafiə edir və ona çağırırlar.”

Habelə şeyx həmin iddiaları rədd etdiyi zaman Abdul-Qadirin qəbrinə ibadət edənləri təkfir etməkdən uzaq olduğunu qeyd etmişdir.Artıq şeyx digər yerlərdə bunların və Kuvvaz günbəzinə, Əbu Talibə, Yusufa və başqalarına ibadət edənlər tək qeyrilərinin təkfir olunduğunu vurğulamışdır.

Belə ki, “məcmu` muəlləfət:63-cü səh” fətvalar bölümünün üçüncü qismində demişdir: “Ələxsus Muveys və onun mislində olanların Kuvvaz günbəzi və onun əhli ilə etdikləri, habelə onun, ibn İsmailin, ibn Rabianın və Nəcd

alimlərinin Məkkədə həbs ilində Əbu Talibin günbəzinə tapınanlarla etdikləri və bunu inkar edənlərin öldürüləcəyinə dair fətva verdikləri və onları qətlə yetirib onların mallarını götürməyin Allaha yaxınlaşdıran əməl olduğuna və yəhudi və nəsranilərə haram olan Həramın onlara haram olmadığına dair fətva verdikləri bilinəcəyi zaman onlarla bərabər tüğyan edən diri şəxslərin etdikləri bu əməllərdən tövbə edib İslama girib girmədikləri haqqında düşün! Onlar bilmişlər ki, onların etidklərinin onda biri bütün məzhəblərin icması ilə İslamdan çıxmağı ifadə edən mürtədlikdir."

Öncəki mənbədə "68-ci səh" demişdir: "Lakin məxluqa dua edəni pisləməyimiz, qəbirin yanına gəlib şeyx Abdul-Qadirin yaxud digərinin məzarı yanında Uca Allaha dua edib yalvaranı və həmin yerdə kədəri aparmağı və çətinlikdə olana yardım etməyi və ehtiyacları təmin etməyi istəyəni pisləməyimizdən daha böyükdür."

Habelə "məcmu` əl-muəlləfət:68-ci səh" kitabının şəxsi məktublar bölümünün beşinci qismində demişdir: "Lakin mən qəti bilirəm ki, Əbu Talibin günbəzinə ibadət edənlərin küfrü Muveys və onun mislində olanların küfrünün onda bir hissəsinə belə çatmır."

Habelə öncəki mənbədə "209-210-cu səh" Əhməd bin İbrahim Mutavvı` Mərat adlı şəxsə göndərdiyi məktubda demişdir: Əslində şeyxin dönəmində, ibn Teymiyyə qəsd edilir, elm və təlif iddiasında olanlardan bəziləri tövhidi inkar etmiş və onu peyğəmbərləri və övliyaları təhqir olaraq qələmə vermişlər.Habelə onlar bu yolda olanları təkfir

etmişlər.Elə isə, Kuvvaz günbəzinə və onun milsində olana ibadət edənlərin bunu inkar etmədiyini necə iddia edirsən?! Üstəlik onların bunu qəbul edib bunu etiqad etdiklərini və şirkdən uzaq olduqlarını iddia edirsən."

Habelə "65-ci səh" demişdir: "Nəhayət azmış insanlar Abdul-Qadir Ceylani, Əhməd Bədəvi, Adiyy bin Musəfir və digər abid və saleh insanlar kimi salehlərdən olan insanları darda və rifah halında sələməyə başlamışlar.Elm əhli isə onlara sərt şəkildə irad tutub onlara bu işdə əngəl olmuş və onları çox təkidlə bundan çəkindirmişlər.

Daha sonra Şeyxul-İslam ibn Teymiyyənin (rahiməhullah) növbəti sözlərini nəql etmişdir: Bilmək lazımdır ki, İslama nisbət olunan şəxs bəzən dindən çıxır.Bunun müəyyən səbəbləri vardır.Onlardan: Uca Allahın pislədiyi ifratdır.Məsələn Adiyy bin Musəfir yaxud qeyrisinə dair ifrata varmaq. Üstəlik Əli bin Əbu Talibə dair ifrata varmaq.Üstəlik Məsihə dair ifrata varmaq v.s.Belə ki, peyğəmbərə yaxud səhabəyə yaxud saleh bir kişiyə dair ifrata varıb ona bir növ ihalıq vəsfi verən, məsələn: Ey filankəs ağam mənə yardım et yaxud sən mənə kifayətsən v.s,-deyən şəxs kafirdir.Beləsi tövbəyə çağırılar.Tövbə etməzsə öldürülər."

Habelə şeyx daimə əleyhdarlarına qarşı dəlil gətirdiyi "əl-iqna`" kitabının sahibinin sözlərini nəql etdikdən sonra demişdir "147-148": Müəllif "əl-iqna`" kitabında mürtədin hökmünə dair bölümdə özü ilə Allah arasında vasitə tutub onlara dua edənin kafir və malı və qanı halal olan mürtəd olduğuna bütün məzhəblərin icmasını qeyd etmişdir.Habelə orada qeyd etmişdir ki, imam səhabələri söyən rafizinin tək-

firinə dair dayanmışdır.Lakin əgər o, Əlini darda və rifah halında çağırarsa onun küfründə heç bir şübhə olmayacaq. Bu, onun "əl-iqna`" kitabında olan sözlərinin mənasıdır. Belə ki, Əli bin Əbu Talibin (r.a) dönəmində bəzi insanlar onun fayda və zərər vermək iqtidarında olduğunu etiqad etdikləri zaman həmin insanların ibadət əhlindən olmalarına rəğmən o, onları odda yandırmışdır.Habelə Şəmsən və onun mislində olanlara dua edənlərin küfründə heç bir şübhə yoxdur."

Habelə demişdir "166-cı səh": "Kim gecə və gündüz Allaha ibadət edər daha sonra qəbiri yanında peyğəmbəri yaxud övliyanı çağırarsa iki ilah etmiş olar və "lə iləhə illəllah" şəhadətini gətirmiş olmaz.Çünki ilah çağırılandır. Günümüzdə Zubeyr yaxud Abdul-Qadir yaxud başqalarının qəbiri yanında, habelə bundan öncə Zeyd və qeyrilərinin qəbirləri yanında müşriklərin etdikləri əməllər eynilə bu qəbildəndir."

Habelə "216-cı səh" demişdir: "Şeyxin sözləri, yəni ibn Teymiyyənin sözləri, Yusuf və onun mislində olanların qəbiri üzərində olan bütə ibadət edib onlara darda və rifah halında dua edənlərin küfrünə dair qaranlıq məqamı aradan qaldırır."

Habelə müəyyən şəxsin təkfir edilməsini inkar edənə rəddiyəsində demişdir "222-ci səh": "Alimləriniz qatında dörd imamdan biri olmasına rəğmən Fəxru-r-Razinin İslamdan çıxmasına dair onun icmanı açıq xəbər verməsi haqqında düşün! Məgər insan Abdul-Qadirə darda və rifah halında dua edərsə, habelə Abdullah bin Aunı sevərsə və Əbu

Hadidəyə ibadət etməsi ilə birgə öz dininin gözəl olduğunu iddia edərsə, yenəmi bu, müəyyən şəxsin təkfir olunmayacağına dair onun sözlərindən anladığın mənaya münasib gələcək?

Habelə şeyx, ibn Suheymin qəbirlərə ibadət edənləri təkfir etməli olduğunu və müsəlman şirkə düşəcəyi zaman bununla kafir olacağını vurğulayarkən demişdir: "Sən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xəbər verdiyi xəvariclər barədə nə deyirsən: "And olsun Allaha ki, əgər mən onlara yetişsəydim onları ad tayfası tək qırardım.Siz onları harada rastlasanız öldürün!".Məgər sən onların qiblə əhlindən olmadığını düşünürsən? Habelə sən bir çox insanların Abdul-Qadirə və qeyrilərinə dair sahib olduqları etiqad tək Əli bin Əbu Talibə dair etiqadda olan şəxslər barədə nə deyirsən? Əli bin Əbu Talib (r.a) onlar üçün tonqal qalamış və onları odda yandırmışdır.Habelə bütün səhabələr onların qətlə yetirilməsinə icma etmişlər.Sadəcə ibn Abbas (r.a) onların odda yandırılmasına etiraz etmiş və onların qılıncla öldürülməsini irəli sürmüşdür.Məgər siz bunların qiblə əhlindən olmadığını düşünürsüz?".

Habelə şeyx ona qarşı irəli sürülən iddiaları rədd edib ondan uzaq olduğunu qeyd edərkən demişdir: (Güya mən deyirəm): "Alimlərin ixtilafı əzabdır." Artıq şeyx "əl-fətəva-35-ci səh" kitabının üçüncü qismində alimlərin ixtilafının rəhmət olub olmamasına dair söz haqqında demişdir: "Onlar demişlər: Onların ixtilafı rəhmətdir.Bu, batildir.Əksinə rəhmət camaatda, əzab isə parçalanmadadır.Uca Allah

buyurur: *"Onlar hələ də ixtilafdadırlar.Rəbbinin rəhm etdiyi kimsələr istisnadır."*[105] Bitdi.

Bütün bu sözlərdə məqsəd, Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbdən (rahiməhullah) nəql edilən və haqqa müxaliflik təəssüratını yaradan sözlərin ümumi mənafeyə zərər yetirməyəcək surətdə əleyhdara güzəştə getmək halına aid edilir.Şeyxin özü bunu Hudeybiyyə sülhünə dair çıxarılan faydalarda qeyd etmişdir: Səksəninci: Ehtiyac zamanı kafirlərin müəyyən yoluna müvafiq gəlmək caizdir." (bə`du fəvaid sulhil hudeybiyyə, mulhəq əl-musannəfət dımnə məcmu`əl-fətəva:11-ci səh).

Habelə bu sözlər haqqında həmin sözlərin şeyxin köhnə sözləri olması etibarı ilə cavab veriləcək.Sonralar şeyxə məsələyə dair doğru görüş bəlli olmuşdur.Heç şübhəsiz ki, bu alimin şənini kiçiltmir.Bəzən şeyx müxtəlif yerlərdə bir məsələyə dair dayanır yaxud müxalif olur daha sonra ona həmin məsələyə dair doğru olan bəlli olur və şeyx bunu digər yerlərdə deyir.Bu, demək olar ki, qədim zamanlardan bəri, səhabələr və onlardan sonra gələnlərdən olan bütün alimlərin üzləşdiyi təzahürdür.Ondan iki görüş nəql edilməklə bərabər onun seçdiyi görüş bəyan edilir.Əgər bizə onun seçdiyi görüş bəlli olmursa bizim onun sözlərindən yalnız sunnəyə müvafiq olanı götürmək caiz olur.Bu halda bizə dəlilsiz və sübutsuz görüşlərdən birini götürüb digərini tərk etmək olmaz.Habelə Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbin (rahiməhullah) məzhəbinə və onun tövhiddə cahilliyin üzr olmadığını etiqad etdiyinə dəlalət edən sübut-

[105] Hud:118-119.

lar vardır. Çünki şeyx bunu ən məşhur kitabı olan "kitəbu-t-təuhid"də, habelə "kəşfu-ş-şubuhat" kitabında, "ər-raddu alə-r-rafida" və başqa kitablarda vurğulamışdır.Təlif isə araşdırma və tədqiq üzərə qurulan işdir.Bu üzdən, öcəşkən birisinin alimin müəmmalı və gizli qalan sözlərini araşdırıb onun açıq-aşar sözlərini tərk etməsi doğru deyil.Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbdən (rahiməhullah) bu kimi ifadələri dəlil gətirən şəxslərə şeyx İshaq bin Abdur-Rahmənin (rahiməhullah) dediyi kimi deyiləcək.Şeyx demişdir: "Həqiqətən də, Quran və sunnədən olan dəlillər, habelə Şeyxul-İslamın və ibnul Qayyimin sözləri birgə gələn şeyxin bir çox yerdə dediyi sözlərinin necə tərk edilməsi təəccüb doğurmaya bilməz.Misal üçün şeyx deyir: Əgər birinə Quran çatarsa artıq onun üzərindən hüccət qalxmış olar.Bunun müqabilində isə bir yerdə yığcam şəkildə gələn sözlər qəbul edilir."

Allah şeyxə rəhmət eləsin, həqiqətən də, o doğru söyləmişdir.Bu kimi rədd əsnasında və iddiaların dəf edilməsi zamanı deyilən və mübahisə doğuran ifadələrdən tutunub Şeyxul-İslamın tövhid kitabı, kəşfu-ş-şubuhat və digər kitablar kimi müəllifi olduğu kitabların bir çox yerində qayda və təməl olaraq vurğuladığı və qeyd etdiyi sözləri buraxanlar insanda təəccüb doğurmaya bilməz.Şübhəsiz ki, bu nəfsi istəklərə uyanların durumudur.Bu kimi şəxslərə yuxarıda Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəbin vurğuladığı misal uyğun gəlir.Onlar milçək mislindədirlər. Yalnız murdaş şeylərə qonurlar.

Sonda Uca Allahdan haqqa müvəffəq olan şəxslərdən olmağı diləyirəm.Heç şübhəsiz ki, hidayət və doğru səmt

yalnız Allahdandır.Habelə mən bu kitabı gözdən keçirən hər bir şəxsə orada yazılanlara diqqətlə yanaşmasını tövsiyə edirəm.Əgər kiminsə hər hansı bir düzəlişi yaxud əlavəsi varsa nəsihətçi müsəlman olaraq ədəb və ərkanı ilə bizə onu təqdim etsin.Mənim kimi birisinə isə dəlil ilə gələcək şəxsdən haqqı qəbul etmək vacibdir.Haqq yolda sonuncu olmağım batil üzərə öndə getməyimdən mənə daha xeyirlidir.Doğru yola müvəffəq edən və aparan Uca Allahdır.

Aləmlərin Rəbbi olan Allaha həmd olsun!